**Kitabın adı:** Allaha atılmış iftira: “Ərşin səsi” hədisi

**Müəllif:** Muhəmməd Əli Həsən

**Tərcüməçi:** Ramil Aslanlı

**Redaktor:** Peyman Məmmədov

**Dizayn:** Xəlil Məmmədov




# MÜNDƏRİCAT

**Bağışlayan və mehriban Allahın adı ilə!**

**“Allahı Ona layiq tərzdə tanımadılar”.**

Qurani-kərim

Aləmlərin Rəbbi olan Allaha həmd olsun! Bütün naqisliklər və zalımların söylədiklərindən pak və münəzzəh olan Uca Allaha həmd olsun! Mürsəllərin seyidi (ağası), bütün yaranmışların ən şərəflisi olan Muhəmməd bin Abdullaha (sallallahu əleyhi və alihi və səlləm) və onun pak Əhli-Beytinə (əleyhimussəlam) salam və salavat olsun! Bu andan qiyamət gününədək onların bütün düşmənlərinə lənət olsun!

Mən bundan əvvəl “Ərşin səsi” hədisi barədə müxtəsər bir tədqiqat yazmışdım. Təcsim (Allahın cismləşdirilməsi) əqidəsində olanların nəql etdikləri ən çirkin hədis məhz bu hədisdir. Həmin vaxt işlərin çoxluğundan bu hədisi geniş şəkildə araşdırmamışdım. Daha sonra bu tədqiqatı daha geniş surətdə hərtərəfli araşdırmaq və onların Allah-taala barədə pis etiqadlarını üzə çıxartmağı qərara aldım. Mündəricatda qeyd olunduğu kimi, mövzunu bir neçə qismə böldüm. Allah-taaladan bu tədqiqatın qəlblərində Allah və Onun haqq dininin qeyrətini çəkən hər bir müsəlman şəxsə faydalı olmasını diləyirəm. Oxuculardan Ustad İbrahim Naziriyə (Allah ona rəhmət etsin) həmçinin, bu sətirlərin müəllifini dua etməyi unutmamalarını rica edirəm. Aləmlərin Rəbbi olan Allaha həmd olsun!

Muhəmməd Əli Həsən

11 fevral 2013

## Birinci mövzu: “Ərşin səsi” sifətinin mənası

1. Xəlil bin Əhməd Fərahidi belə deyir:

أط: أطيط: الاط و الاطيط - **“yüklərdən çıxan səs”. “üst-üstə yığılan ağır şeylərdən çıxan səs”.** الأطاط – **“qışqırıq, səs-küy”.** أطيط الابل – **“yükün ağırlığından dəvənin iniltisi”.**

2. Cövhəri belə deyir:

الاطيط – **“yükün ağırlığından yəhər və dəvədən çıxan səs”.** Yaxud da, **“yük silkələnərkən çıxan səs”.**

3. İbn Mənzur belə deyir:

الاط و الاطيط – “**yükün ağırlığına görə dəvənin belinə qoyulmuş yəhərdən çıxan səs**”. Həmçinin, “**yükün ağırlığının səsinə bənzəyən hər bir səs**”, “**dəvənin səsi**”, “**dəvənin belindəki yükün ağırlığına görə çıxartdığı səs**”. الاطيط - “**belindəki yükün ağırlığına görə yəhər və dəvədən çıxan səs**”.

## İkinci mövzu: “Ərşin səsi” hədisinin nəql olunma yolları.

Əhli-Sünnə məzhəblərinin hədis hafizlərinin çoxu hədis və əqidə kitablarında “Ərşin səsi” hədisini nəql etmişlər. Bu araşdırmada tədqiq etdiyim bu hədisin nəql olunma yollarını qeyd edəcəm.[1]

**1. Osman bin Darami Sicistani “ər-Rəddu aləl-Cəhəmiyyə” kitabında belə nəql edir:**

Muhəmməd bin Bəşşar Əbdi Vəhəb bin Cərirdən belə nəql edir: “Eşitdim ki, Muhəmməd bin İshaq Yaqub bin Ətəbədən, o, Cübeyr bin Muhəmməd bin Mütimdən, o da öz atasından belə nəql edir: “**Bir bədəvi ərəb Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəldi və belə dedi: “Ey Muhəmməd, mal-qara həlak oldu. Biz səni Allahın yanında şəfaətçi edirik. Səni and veririk Allaha! Dua et ki, bizim üçün yağış yağdırsın”. Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: “Ey bədəvi, vay olsun sənə! Nə dediyini bilirsənmi? Allah-taala yaratdıqlarından hər hansı birinin yanında şəfaətçi edilməkdən daha böyükdür. Allah ərşinin üzərində - səmaların üstündədir. Səmaları gümbəz kimi (əli ilə gümbəz kimi işarə etdi) yerinin üzərindədir. “O (ərş), üzərindəki yükə görə yəhər kimi səs çıxarır**”. [2]

---

[1] Mülahizə: Ola bilər ki, bu hədisi nəql edən kitabları tədqiq edən hər hansı bir araşdırmaçı “Ərşin səsi” hədisini zəif və ya səhih hesab etsin. Biz indi bu barədə danışmırıq. Biz bu qisimdə yalnız hədisi nəql edən mənbələri qeyd edəcəyik. Sonrakı movzularda təcsim əqidəsinin başında duranların bu hədisə etimad etmələri barədə geniş danışacağıq.

[2] “ər-Rəddu aləl-Cəhəmiyyə”, səh. 49, hədis 71.

**2. İbn Əbu Asim "əs-Sunnə" kitabında belə nəql edir:**

İsmail bin Sani Yəhya bin Əbu Bəkrdən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömər bin Xəttabdan (Allah ondan razı olsun) belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: "Onun ərşi yeddi göyün üstündədir. (Üstündə oturduqda) üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".

Əbdüləla bin Həmmad Nərsi və Muhəmməd bin Müsənna belə deyirlər: "Vəhəb bin Cərir atasının belə dediyini nəql edir: "Muhəmməd bin İshaqın Yaqub bin Ətəbə və Cübeyr bin Muhəmməddən, onun öz atasından, onun da babasından belə nəql etdiyini eşitdim: "**Bir bədəvi Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal həlak olmaqda, bədənlər qurumaqda, mal-dövlət isə məhv olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını istə! Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: "Vay olsun sənə! Heç bilirsən nə deyirsən?". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) zikr etməyə başladı. O qədər zikr etdi ki, səhabələrinin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: "Vay olsun sənə! Allah öz yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allah-taalanın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsənmi Allah kimdir? Onun ərşi səmalarının və yerinin**

**üzərindədir. Bu cür gümbəz kimi. O (ərş) üzərindəki yükə görə (Allahın üzərində oturmasına görə) yəhər kimi səs çıxardır**”.[3]

**3. İbn Xüzeymə “ət-Tohid” kitabında belə nəql edir:**

Muhəmməd bin Bəşşar Vəhəbdən - yəni İbn Cərirdən belə nəql edir: “Atam dedi ki, Muhəmməd bin İshaqın Yaqub bin Ətəbədən, onun Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən, onun öz atasından, onun da babasından belə etdiyini eşitdim: “**Bir bədəvi ərəb Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib belə dedi: “Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal həlak olmaqda, mal-dövlət məhv olmaqda, mal-qara isə həlak olmaqdadır. Allahdan bizə yağış yağdırmasını istə! Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik”. Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: “Vay olsun sənə! Heç bilirsən nə deyirsən?”. Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) zikr etməyə başladı. O qədər zikr etdi ki, səhabələrinin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: “Vay olsun sənə! Allah öz yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allah-taalanın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsənmi Allah kimdir? Allah ərşinin üzərindədir. Onun ərşi səmalarının və yerinin üzərində bu cürdür”. Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) barmaqları ilə gümbəz kimi elədi. “O (ərş)**

[3] “əs-Sunnə”, c. 1, səh. 251-252, hədis 574 və 575; Albaninin tədqiqi ilə. “əl-Məktəbul-islami” mətbəəsi.

**üzərindəki yükə görə (Allahın üzərində oturmasına görə) yəhər kimi səs çıxarır**”. [4]

**4. Hədis hafizi olan Əbu Əvanə İsfirayini “Mustəxrəc” kitabında belə nəql edir:**

Əbüləzhər Vəhəb bin Cərirdən, o da atasından belə nəql edir: “Muhəmməd bin İshaqın Yaqub bin Ətəbədən, onun Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən, onun öz atasından, onun da babasından belə nəql etdiyini eşitdim: “**Bir bədəvi ərəb Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: “Ey Allahın rəsulu, canlar ölüm ayağında, əhl-əyal ac, var-dövlət isə məhv olmaqdadır. Rəbbindən bizim üçün yağış istə. Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik”. Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: “Sübhanallah! Sübhanallah!”. Sonra o qədər zikr etdi ki, səhabələrinin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: “Vay olsun sənə! Bilirsənmi Allah kimdir? Allah-taalanın şəni bundan daha böyükdür. Onun yanında heç kim şəfaətçi edilməz. O, səmaların üstündə - öz ərşinin üzərindədir. O (səma) onun (yerin) üzərində bu cürdür**”. Vəhəb əli ilə gümbəz kimi işarə etdi. Əbüləzhər həmçinin belə işarə etdi və dedi: “**O (ərş) üzərindəki yükə görə (Allahın üzərində oturmasına görə) yəhər kimi səs çıxardır**”. [5]

---

[4] “ət-Tohid”, c.1, səh. 239, 240. ər-Riyad şəhəri.

[5] “Mustəxrəcu Əbu Əvanə”, c. 2, səh. 120, hədis 2517.

**5. Hədis hafizi olan Əbu Bəkr Aciri "əş-Şəriət" kitabında belə nəql edir:**

Əbu Bəkr Səlmə bin Şəbibdən, o da Həfs bin Əbdürrəhmandan belə nəql edir: "Muhəmməd bin İshaqın Yaqub bin Ətəbədən, onun Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən, onun öz atasından, onun da babasından belə nəql etdiyini eşitdim: "**Mən Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanında idim. Bir bədəvi ərəb onun yanına gəlib dedi: "Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal ac, var-dövlət məhv, mal-qara isə həlak olmaqdadır. Bizim üçün yağış yağmasını istə. Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: "Nə danışdığını bilirsənmi?". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) o qədər zikr etdi ki, səhabələrin çöhrələrində nigaranlıq özünü biruzə verdi. "Vay olsun sənə! Allah-taala heç kimin yanında şəfaətçi edilməz. Allahın şəni bundan daha böyükdür. O, səmaların üstündə - öz ərşinin üzərindədir. O (səma) gümbəz kimidir. (Əli ilə gümbəz kimi işarə etdi). O (ərş) üzərindəki yükə görə yəhərdən çıxan səs kimi səs çıxardır**".[6]

**6. Hədis hafizi olan Təbərani "əl-Mucəmul-Kəbir" kitabında belə nəql edir:**

Zəkəriyyə bin Saci Əbdüləla bin Həmmad Nəris, Abdullah bin Əhməd bin Hənbəl, Yəhya bin Müin, Məaz bin Müsənna və Əli bin Mədəni belə

---

[6] "əş-Şəriət", c. 3, səh. 1090, 1091, hədis 667. Doktor Abdullah bin Ömər Dəmicinin tədqiqi ilə olan çap. ər-Riyad şəhəri.

deyirlər: Vəhəb bin Cərir atasının belə dediyini nəql edir: "Muhəmməd bin İshaqın Yaqub bin Ətəbədən, onun Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən, onun öz atasından, onun da babasından belə nəql etdiyini eşitdim: "**Bir bədəvi ərəb Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal həlak, var-dövlət məhv, mal-qara isə həlak olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını istə. Biz səni Allah-taala yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: "Vay olsun sənə! Nə danışdığını bilirsənmi?". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) zikr etdi. O qədər zikr etdi ki, səhabələrinin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: "Vay olsun sənə! Allah yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allahın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsən Allah-taala kimdir? Onun ərşi səmaların üstündədir". Barmaqları ilə işarə edərək "gümbəz kimidir" - dedi. Sonra buyurdu: "O (ərş) üzərindəki yükə görə yəhərdən çıxan səs kimi səs çıxardır**". [7]

**7. Hədis hafizi olan Müqəddəsi "əl-Əhadisul-Muxtara" kitabında belə nəql edir:**

Əbu Müslim Müəyyəd bin Əbdürrəhim bin Əhməd bin İxvə bizə xəbər verdi ki, İsfahanda ona yanında olarkən ona dedim: Əbu Abdullah Hüseyn bin Əbdülməlik Xəllaf sizə xəbər verdi və sən bunu eşitmisən. İbrahim bin

---

[7] "əl-Mucəmul-Kəbir", c. 2, səh. 128, hədis 1547. İbn Teymiyyə kitabxanasının mətbəəsi, Qahirə şəhəri.

Mənsur Muhəmməd bin İbrahim bin Əlidən, o, Əhməd bin Əli bin Müsənnadan, o, Züheyrdən, o, Yəhya bin Əbu Bükeyrdən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərdən belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: "Onun ərşi yeddi göyün üstündədir. Üstündə oturduqda üzərinə qoulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".

Əbu Cəfər Muhəmməd bin Əhməd bin Nəsr bin Əbülfəth bizə xəbər verdi ki, İsfahanda, onun yanında olarkən ona dedim: "Mahmud bin İsmail Seyrəfi sizə nəql etmişdir və sən də onun yanında idin. Muhəmməd bin Abdullah bin Şazandan, o, Abdullah bin Muhəmməd Qəbbabdan, o, Əhməd bin Əmr bin Əbu Asimdən, o, İsmail bin Salim Sayiğdən, o, Yəhya bin Əbu Bükeyrdən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömər bin Xəttabdan belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: "Onun ərşi yeddi göyün üstündədir. Üstündə oturduqda üzərinə qoulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".

Əbu Cəfər Muhəmməd bin Əhməd də İsfahanda bizə xəbər verdi ki, Mahmud bin İsmail (o da orada idi) onlara belə demişdir: Əhməd bin Muhəmməd bin Şazandan, o, Süleyman bin Əhməd Təbəranidən, o, Muhəmməd bin Abdullah Həzrəmidən, o, Abdullah bin Əbu Ziyad Qətvanidən, o, Yəhya bin Əbu Bükeyrdən, o, İsraildən, o, Əbu İshaq bin

Abdullah bin Xəlifədən, o da Ömər bin Xəttabdan (Allah ondan razı olsun) belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə dedi: "Onun kürsüsü göyləri və yeri əhatə etmişdir. O (Allah), onun üzərində oturur və ondan (kürsüdən) dörd barmaq kənara çıxır". Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) barmaqlarını bir yerə cəm edib göstərdi. "Üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**". Şöbə bu hədisi Əbu İshaqdan nəql etmişdir (Hədisin sənədi həsəndir).

Abdullah Hərimi Bağdadda bizə xəbər verərək belə dedi: "Ğalib Əhməd bin Həsən bin Əhməd bin Bənnadan, o, Həsən bin Əli Cövhəridən, o, Muhəmməd bin Müzəffər bin Musa Hafizdən, o, Muhəmməd bin Əhməd bin Xalid Qazidən, o, Səid bin Muhəmməddən, o, Səlim bin Qüteybədən, o, Şöbədən, o, Əbu İshaq bin Abdullah bin Xəlifədən, o da Ömər bin Xəttabdan (Allahın rəhməti olsun ona) belə nəql edir: "**Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) "Rəhman olan Allah ərşin üzərində qərar tutdu" ayəsi barədə belə buyurdu: "Hətta ərşdən yəhərin səsi kimi səsin çıxdığı eşidilir**".[8] (Bu hədisin sənədi həsəndir).

**8. Əbu Davud Sicistani özünün "Sunən" kitabında belə nəql edir:**

Əbdüləla bin Həmmad, Muhəmməd bin Müsənna, Muhəmməd bin Bəşşar və Əhməd bin Səid Rəbati belə deyirlər: "Vəhəb bin Cərir bizə belə

[8] "əl-Əhadisul-Muxtara", c. 1, səh. 263, hədis 151, 152, 153 və 154

nəql edərək dedi: "Əhməd dedi: "Onun nüsxəsindən üzünü köçürdük. O, belə demişdir: "Atam belə nəql edir: "Muhəmməd bin İshaqın Yaqub bin Ətəbədən, onun Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən, onun öz atasından, onun da babasından belə nəql etdiyini eşitdim: "**Bir bədəvi ərəb Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu, canlar ölüm ayağında, əhl-əyal həlak olmaqda, var-dövlət məhv, mal-qara isə həlak olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını istə. Biz səni Allah-taala yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: "Vay olsun sənə! Nə danışdığını bilirsənmi?!". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) zikr etdi. O qədər zikr etdi ki, səhabələrin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra O, belə buyurdu: "Vay olsun sənə! Allah yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allahın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsən Allah-taala kimdir? Onun ərşi səmaların üstündədir". Barmaqları ilə işarə edərək "gümbəz kimidir" – dedi və sonra belə buyurdu: "O (ərş), üzərindəki yükə görə yəhərdən çıxan səs kimi səs çıxardır**". İbn Bəşşar nəql etdiyi hədisdə belə deyir: "**Allah ərşin üzərindədir. Onun ərşi səmalarının üstündədir**". Sonra bu hədisi nəql etmişdir. Əbdüləla belə deyib: "İbn Müsənna və İbn Bəşşar Yaqub bin Ətəbə və Cübeyr bin Muhəmməd bin Cübeyrdən, o, öz atasından, o da babasından nəql etmişdir. Hədis Əhməd bin Səidin sənədi ilə səhihdir. Yəhya bin Müin, Əli bin Mədəni və başqaları bu hədisi qəbul edirlər. Bir dəstə camaat İbn İshaqdan bu hədisi Əhmədin nəql etdiyi kimi nəql

etmişlər. Mənə çatan xəbərə əsasən, Əbdüləla, İbn Müsənna və İbn Bəşşarın dinlədiyi hədis vahid nüsxədəndir”.[9]

**9. Hədis hafizi olan Əbüşşeyx İsfahani “əl-Əzəmət” kitabında belə nəql edir:**

İbrahim bin Səid Cövhəridən, o, Əbdürrəhman bin Mübarəkdən, o, Səiq bin Həzən və Əli bin Həkəmdən, o, Osman bin Ümeyrdən, o, Əbu Vaildən, o da Abdullah Məsuddan (Allah ondan razı olsun) belə nəql edir: “**Ey Allahın rəsulu, “məqamul-mahmud” nədir?”. (Peyğəmbər) buyurdu: “Bu, həmin gündür ki, Allah-taala (öz) ərşinin üzərinə enər və ondan (ərşdən) yeni yəhərdən çıxan səs kimi səs çıxar**”.[10]

**10. Hakim Nişapuri “əl-Mustədrəku aləs-Səhiheyn” kitabında belə nəql edir:**

Əbu Abdullah Muhəmməd bin Yaqub Şeybani Yəhya bin Muhəmməd bin Yəhyadan, o, Əbdürrəhman bin Mübarək Əbəsidən, o, Səiq bin Həzəndən, o, Əli bin Həkəmdən, o, Osman bin Ümeyrdən, o, Əbu Vaildən, o da İbn Məsuddan (Allah ondan razı olsun) belə nəql edir: “**Məlikənin iki oğlu (Peyğəmbərin) yanına gəldilər. Onlar ənsardan idilər. Belə dedilər: “Ey Allahın rəsulu, anamız ərinin hörmətini qoruyur və qonağa hörmət edir. Cahiliyyət dövründə körpəsini (diri-diri) torpağa basdırmışdır. İndi anamız haradadır?”. (Peyğəmbər) buyurdu: “Ananız**

---

[9] “Sunəni Əbu Davud”, hədis 4726.

[10] “əl-Əzəmət”, c. 2, səh. 594.

**Cəhənnəmdədir". Onlar durub getdilər. Bu söz onlara ağır gəldi. Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) çağırdı və onlar geri döndülər. (Peyğəmbər) buyurdu: "Mənim anam da sizin ananızla bir yerdədir". İnsanlar içərisində münafiqlərdən biri mənə dedi: "Bu, onun anasının dərdinə dəyməz. Yalnız Məlikənin iki oğlunun analarına (olan acının yüngülləşməsinə) fayda verər. Biz də onun ardınca addımlayırıq". Ənsardan olan bir gənc dedi: "Onun qədər Allah rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) sual soruşan birini görmədim. "Ey Allahın rəsulu, belə düşünürəm ki, atan da Cəhənnəmdədir". (Peyğəmbər) buyurdu: "Rəbbimdən onlar üçün bir şey istəməmişəm ki, mənə əta etsin. Mən həmin gün məqamul-mahmudda duracam". Münafiq ənsardan olan gəncə dedi: "Ondan məqamul-mahmudun nə olduğunu soruş". (Həmin gənc) soruşdu: "Ey Allahın rəsulu, məqamul-mahmud nədir?". (Peyğəmbər) buyurdu: "O, həmin gündür ki, Allah (öz) kürsüsünün üstünə enər. Kürsü göylə yer arasında kürsüdən yəhər (üzərindəki yükün ağırlığından) səs çıxartdığı kimi səs çıxar. Sizi ayaqyalın, lüt və sünnətsiz halda gətirəcəklər. Ən birinci geyinən İbrahim (əleyhissəlam) olacaqdır. Allah-taala buyurar: "Dostumu cənnət parçasından iki parça ilə geyindirin". Onun dalınca mən geyinərəm və Allah-taalanın sağ tərəfində - əvvəldə və sonda olanların qibtə etdikləri bir məqamda dayanaram. Kövsərdən mənim hovuzuma bir çay axar". Münafiq belə dedi: "Bugünki kimi söhbət eşitməmişəm. Saxsıda və ya xırda daşlar üzərində axan çaylardan başqa çox az çay vardır. Soruş, görək həmin çay nəyin üzərində axır?". (Peyğəmbər) buyurdu: "Müşk halında və xırda daşlar üzərində". Münafiq belə dedi: "Bu günki kimi söz eşitməmişəm. Elə axar çay yoxdur ki, onun otları olmasın". (Peyğəmbər) buyurdu: "Bəli".**

**(Münafiq) soruşdu: "Hansı otlar?" (Peyğəmbər) dedi: "Qızıl qamışlar".** (Ravi) dedi: **"Münafiq belə dedi: "Bugünki kimi söz eşitməmişdim. Allaha and olsun, elə qamış yoxdur ki, bitsin, amma onun bəhəri olmasın. Soruş ondan ki, həmin qamışların bəhəri nədir?". (Peyğəmbər) dedi: "Bəli. (Onun bəhəri) ləl-cəvahiratdır". Münafiq dedi: "Bu günkü kimi söz eşitməmişdim. Ondan Hovuzun suyu barədə soruş". Ənsardan olan gənc dedi: "Ey Allahın rəsulu, hovuzun suyu necədir?". (Peyğəmbər) buyurdu: "Süddən daha ağ, baldan daha şirin. Allah kimə o sudan içirdərsə, (həmin kəs) heç vaxt susamaz. Kimi (o sudan) məhrum edərsə, (həmin kəs) heç vaxt sudan doymaz**".

Bu hədisin sənədi səhihdir, lakin (Buxari və Müslim onu) qeyd etməmişlər. Burada Osman bin Ümeyr İbn Yəqzandır.[11]

**11. Hədis hafizi olan Darami özünün "Sunən" kitabında belə nəql edir:**

Muhəmməd bin Fəzl Səiq bin Həzəndən, o, Əli bin Həkəmdən, o, Osmab bin Ümeyrdən, o, Əbu Vaildən, o da İbn Məsuddan Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) barəsində belə nəql edir: "**Ondan (Peyğəmbərə) "məqamul-mahmud" nədir? - deyə soruşdular. (Peyğəmbər) belə buyurdu: "O, həmin gündür ki, Allah-taala (öz) kürsüsünə enər. Göylə yer arasında yəhər (üzərindəki yükün ağırlığından) səs çıxartdığı kimi kürsüdən səs çıxar. Sizi ayaqyalın, lüt və sünnətsiz halda gətirəcəklər. Ən birinci geyinən İbrahim (əleyhissəlam) olacaqdır. Allah-taala buyurar: "Dostumu cənnət**

---

[11] "əl-Mustədrəku ələs-Səhiheyn", c. 2, səh. 396, hədis 3385.

**parçasından iki parça ilə geyindirin". Onun dalınca mən geyinərəm, Allah-taalanın sağ tərəfində - əvvəldə və sonda olanların qibtə edəcəkləri bir məqamda dayanaram**".[12]

**12. Hənbəli məzhəbində fəqih olan İbn Bətta Əkbəri "əl-İbanətul-Kubra" kitabında belə nəql edir:**

Əbu Bəkr Əhməd bin Salman Mahmud bin Cəfərdən, o, Əbu Bəkr Mərvəzidən, o, Əbu Abdullahdan, o, Həsən bin Musa Üşeybdən, o, Həmmaddan, o, Əta bin Saibdən Şəbinin belə dediyini nəql edir: "**Allah-taala ərşi tamamilə doldurmuşdur. Hətta ərşin yeni yəhərdən çıxan səs kimi səsi olacaqdır**".[13]

**Həmçinin həmin kitabda**:

Əbu Bəkr Əhməd bin Salman Muhəmməd bin Abdullah Həzrəmidən, o, Abdullah bin Həkəmdən və Osmandan, onlar Yəhyadan, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərdən (Allah ondan razı olsun) belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: "Onun kürsüsü yeddi göyü və yeri əhatə etmişdir. O, (Allah) onun (kürsünün) üzərində oturur və ondan dörd barmaq kənara çıxır". Sonra**

[12] "Sunəni Darami", c. 3, səh. 1845, hədis 2842.

[13] "əl-İbanətul-Kubra", c. 7, səh. 167, 177, hədis 133.

**barmaqlarını bir yerə cəm edib göstərdi. "Üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**". [14]

**13. İbn Mündə Müqəddəsi**

O, "ər-Rəddu aləl-Cəhəmiyyə" kitabında belə nəql edir: "Əhməd bin İbrahim Bağdadi Məkkədə bizə belə xəbər verdi: Muhəmməd bin Yəzid Əli bin Müslimdən, o, Əbdüssəməd bin Əbdülvəhhabdan, o, Muhəmməd bin Cəhadədən, o, Səlmə bin Küheyldən, o, Əmarə bin Ümeyrdən, o da Əbu Musanın belə dediyini nəql edir: "**Kürsü iki ayağın yeridir. Onun yəhərin səsi kimi səsi vardır**". [15]

**14. Muhəmməd bin Osman bin Əbu Şeybə "əl-Ərşu və ma Ruviyə fihi" adlı kitabında belə nəql edir:**

Əbdüləla bin Həmmad Vəhəb bin Cərirdən, o da atasının belə dediyini nəql edir: "Muhəmməd bin İshaqın Yaqub bin Ətəbə və Cübeyr bin Muhəmməddən, onun öz atasından, onun da babasından belə nəql etdiyini eşitdim: "**Bir bədəvi Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal həlak, mal-dövlət məhv və mal-qara isə həlak olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını istə! Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə duyurdu: "Vay olsun sənə! Heç bilirsən nə**

[14] "əl-İbanətul-Kubra", c. 7, səh. 178, hədis 135.

[15] "ər-Rəddu aləl-Cəhəmiyyə", səh. 46.

**deyirsən?". Allah rəsulu (sallallahu əleyhi və alihi və salləm) zikr etməyə başladı. O qədər zikr etdi ki, səhabələrin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra belə dedi: "Vay olsun sənə! Allah yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allah-taalanın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsənmi Allah kimdir? Onun ərşi səmalarının və yerinin üzərindədir - bu cür"** – barmaqları ilə gümbəz kimi göstərdi. Vəhəb sağ əlini barmaqları ilə əlinin içini gümbəz kimi vəsf edərək "**Bax, bu cür**" dedi. "**Üzərindəki yükə görə yəhərdən çıxan səs kimi (Allah) ərşin üstündə oturduqda ondan səs çıxar**".[16]

**Həmçinin, həmin kitabda**:

Həsən bin Əli və İsmail bin İbrahim bin Ğəzvan belə deyirlər: "Əbdüssəməd bin Əbdülvaris Muhəmməd bin Cəhadədən, o, Səlmə bin Küheyldən, o, Ümarə bin Ümeyrdən, o da Əbu Musadan (Allah ondan razı olsun) belə nəql edir: "**Kürsü iki ayağın yeridir. Onun yəhərin səsi kimi səsi vardır**".[17]

### 15. İmam Əbülqasim Rafei Şafei

O, "ət-Tədvin fi Əxbari Qəzvin" kitabında belə nəql edir:

İmam Əhməd bin Həsənəveyh ana babası olan Vaqid bin Xəlildən, o, atasından, o, Abdullah bin Muhəmməd Qazidən, o, İsmail bin Muhəmməd Nəhəvidən, o, Abbas bin Muhəmməd Duridən, o, Yəhya bin Əbu Bükeyrdən,

---

[16] "əl-Ərşu və ma Ruviyə fihi", səh. 327, hədis 11.

[17] "əl-Ərşu və ma Ruviyə fihi", səh. 435, hədis 60.

o, İshaq bin Abdullah bin Xəlifədən, o da Ömər bin Xəttabdan (Allah ondan razı olsun) belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu, Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə dedi: "Onun kürsüsü səmaları və yeri əhatə etmişdir. (Ərşin) üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".[18]

[18] "ət-Tədvinu fi Əxbari Qəzvin", c. 1, səh. 116. Əzizullah Ütaridinin tədqiqi ilə.

## Üçüncü mövzu: Təcsim əqidəsinə etiqad bəsləyənlərdən "Ərşin səsi" hədisini nəql edənlər.

Təcsim (cisimləşdirmə, Allaha cisim sifətləri nisbət vermək) və təşbih (ilahi sifətləri məxluqun sifətinə bənzətmək) əqidəsində olan bir çox alimlər bu qondarma hədisin səhih olduğunu bəyan etmiş, məzmununa etiqad bəsləmiş və bütün imkanları ilə bu hədisin səhihliyini qəbul edənlərdan aşağıdakıları qeyd edirik.

**1. İbn Teymiyyə Hərrani**

a) İbn Teymiyyə "Məcməul-Fətava" kitabında belə deyir: "**Həmin hədislərdən biri də, Abdullah bin Xəlifənin Ömərdən, onun da Peyğəmbərdən (sallallahu əleyhi və alihi və səlləm) nəql etdiyi məşhur hədisdir. Əbu Abdullah Muhəmməd bin Əbdülvahid Müqəddəsi "Muxtar" kitabında bu hədisi nəql etmişdir. Əbu Bəkr İsmaili, İbn Covzi və başqaları kimi bəzi hədis əhli bu hədisi rədd etmişlər, lakin Əhli-Sünnənin əksəriyyəti bu hədisi qəbul etmişdir. Bu hədisdə belə deyilir: "Onun (Allahın) ərşi və ya kürsüsü göyləri və yeri əhatə etmişdir. O, ərşin üstündə oturur. Ondan dörd barmaq kənara çıxır. (Ərşin) üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır". Ərşin səs çıxartması Əbu Davudun "Sunən" kitabında Cübeyr bin Mütimdən nəql etdiyi hədisdə qeyd olunmuşdur. İbn Əsakir bu hədis barədə danışmış və tənəsinin ən əsası İbn İshaqa yönəlmişdir. Bu hədisi Əhməd, Əbu Davud və başqa Əhli-Sünnə**

**alimləri nəql etmişlər. Bu hədisə başqa rəvayətlər də şahiddir. "Ərşin səsi" sözü başqa hədislərdə də nəql olunmuşdur..."**.[19]

b) "Təlbisul-Cəhəmiyyə" kitabında belə deyir: "Osman bin Darami öz kitabında belə deyir: "Muhəmməd bin Bəşşar Bəndar və Vəhəb bin Cərir atasından belə nəql edir: "Eşitdim ki, Muhəmməd bin İshaqın Yaqub bin Ətəbədən, o, Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən, o, atasından, o da babasından belə nəql edir: "**Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: "Allah-taala ərşin üstündədir. (Onun) Ərşi yerin üstündəki göylərin üstündədir. (Allah üstündə oturduqda) üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yəhərin səsi kimi səs çıxır**". İmam Əhməd bu hədisi "ər-Rəddu aləl-Cəhəmiyyə" kitabında İbn Bəşşarla yanaşı bir neçə şeyxindən nəql etmişdir. Həmin hədisdə deyilir: "**Bir bədəvi ərəb Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib belə dedi: "Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal həlak, mal-dövlət məhv, mal-qara isə həlak olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını istə! Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: "Allah yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allah-taalanın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsənmi Allah kimdir? Onun ərşi səmalarının üzərində bu cürdür". Barmaqları ilə gümbəz kimi elədi. "O (ərş), üzərindəki yükə görə (Allah üzərində oturduqda) yəhər kimi səs çıxarır**". İbn Bəşşar nəql etdiyi hədisdə: "**Allah göylərinin üstündəki ərşin üzərindədir**" - dedikdən sonra hədisi nəql edir. Hədisdə "**yaratdıqlarından**

---

[19] "Məvmul-Fətava", c. 16, səh. 434, 435.

**heç kim Allahın yanında şəfaətçi edilməz**” sözündən məqsəd budur ki, Allah özü feili edir, bir işin icra edilməsi üçün Onu başqasına şəfaətçi, vasitə etmək olmaz. Necə ki, bəzi şairlər Peyğəmbərə (sallallahu əleyhi və alihi və səlləm) xitab edərək belə deyirlər: “**Sənə şəfaətçim Allahdır, başqası deyil**”.

Hədislə məşğul olanların bəziləri cəhəmiyyəyə qalib gəlmək məqsədilə bu hədisə nöqsan tutmuşlar. Baxmayaraq ki, tətil (sifətlərin inkar olunması) və ya ərşin səsinin çıxmasının eyib hesab olunmasına görə onların söylədikləri sözlər anlaşılmır. Necə ki, tarixçi Əbülqasim belə etmişdir. İrad tuturlar ki, yalnız Muhəmməd bin İshaq Yaqub bin Ətəbədən, o da Cübeyrdən nəql etmişdir. Sonra bəziləri belə deyirlər: “**İbn İshaq “bizə nəql etdi” sözünü deməmişdir. Ehtimal olunur ki, hədisin ravi silsiləsi kəsilmişdir**”. Bəziləri də İbn İshaq barədə bəzilərinin sözlərini əsas gətirirlər. Bu, həmçinin söz və mənada buna bənzər hədislər elm əhli arasında deyilir. Xələf sələfdən bu hədisi nəql etməkdədir. Ümmətin sələf və imamları bu rəvayəti nəql edir, təsdiqləyir və cəhəmiyyədən müxalif olanlara bu hədislə cavab verirlər. Bu hədisi qəbul edirlər. Hətta İmam Əbu Bəkr Muhəmməd bin İshaq bin Xüzeymə etibarlı ravilərin nəql etdiyi rəvayətləri qeyd edəcəyini şərt kəsərək qələmə aldığı “ət-Tohid” kitabında bu hədisi qeyd etmişdir”. [20]

### 2. İbn Qəyyim Covziyyə

a) O, məşhur “Nuniyyə” kitabında belə deyir:

[20] “Təbisul-Cəhəmiyyə”, c. 3, səh. 246, 255.

“**(Allahın) razı qaldığı İbn İshaqın hədisini xatırla,**

**Doğru danışan Rəbbani hafiz.**

**Allah rəsulundan lütf edən Rəbbinə,**

**Yağış yağmasını istəyərək şəfaət dilədikləri əhvalatı.**

**Muxtar (Peyğəmbər) bunu böyük hesab edərək demişdir:**

**Ərşin Rəbbi olan Allahın şəni daha böyükdür,**

**Allah səmasının üstündə - ərşin üzərindədir.**

**Mələkut və səltənət sahibi olan Allah münəzzəhdir.**

**Ərşinin (üstündə oturduqda) səsi çıxır,**

**Tələsən şəxsin mindikdə yəhərindən çıxan səs kimi**”.

Həmçinin o, “Təhzibu Sunəni Əbu Davud”[21] kitabında bu hədisin səhih olduğunu demişdir.

b) “Muxtəsərus-Səvaiqil-Mursilə” kitabında sifətləri inkar edənlərə cavab verərək dəlil gətirərkən belə deyir: **“Bu hədislərdən biri də “Ərşin səsi” hədisidir. Həmin hədisdə Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) belə dediyi qeyd olunur: “Onun (Allahın) kürsüsü göyləri və yeri əhatə etmişdir. O (Allah), kürsüdə oturduqda ondan (kürsüdən) dörd barmaq qədər kənara çıxır. Üzərinə oturduqda ağırlığa görə kürsüdən yəhərdən çıxan səs kimi səs çıxır”. Ömər bin Xəttab belə deyib: “Uca Rəbb kürsünün üstündə oturduqda ondan (kürsüdən) yeni yəhərin səsi kimi səs çıxır”. Vəki bu hədisi nəql edərkən onun yanında**

---

[21] “Təhzib Sunəni Əbu Davud”, c. 4, səh. 2164.

**olan bir şəxs ürpəndi. O, buna görə qəzəbləndi və dedi: "Əməş və Süfyanın bu hədisləri nəql etdiyinə və inkar etmədiklərinə şahid olmuşuq**".[22]

**3. Osman bin Səid Darami.**

O, "ən-Nəqz alə Bişr Mureysi" kitabında belə deyir:

"Müariz Şəbidən belə nəql edir: "**O (Allah), ərşi tamamilə doldurdu. Hətta ərşin yəhərin səsi kimi səsi vardır". Sonra o, Şəbinin sözlərini təfsir edərək belə deyir: "Ayələri və nemətləri doldurdu. Hətta onun yəhər kimi səsi vardır. "Cisim" - daşımaq mənasında deyildir. Allah göylərə, yerə və dağlara əmanəti vermişdir, lakin onlar əmanəti daşımağı qəbul etməmişlər. Əmanət cisim deyildir. Ərşin də bu cür vəsf olunması ehtimal olunur**".

İndi bu Müarizə deyilər: "**Sözlərində tərəddüd edərək sonda Allahın ərşin üzərində olmadığını, nemətlərinin olduğunu dedin. Bu təfsirdən sonra ərşin inkar olunmasından başqa bir şey qalmadı. Vay olsun sənə! Əgər sənin iddiana görə ərşin üzərindəki Allah deyil, nemətləri və ayələridirsə, ərşin ayələr və nemətlərə görə yəhər səsi kimi səs çıxarmasının nə mənası var? Sanki sənə görə daşlar və süxurların ağırlığından ərşin səsi çıxır. Ayələr elə yaradılışlardır ki, ağırlıqları yoxdur. Cisim də deyil ki, ərş ona görə səs çıxartsın**".[23]

**Qeyd: Deməli, yəhər səsi kimi səs cismani ağırlığa görə çıxır.**

[22] "Muxtəsərus-Səvaiqil-Mursilə", c. 1, səh. 538. Qahirə şəhəri.

[23] "ən-Nəqz alə Bişr Murisi", c. 2, səh. 800, 801.

**4. İbn Həzm.**

İbn Teymiyyə "Təlbisul-Cəhəmiyyə" kitabında belə deyir: "**Bu hədislə fələklərin dairəvi olması məsələsində dəlil gətirənlərdən biri də, hədis hafizi olan Əbu Muhəmməd bin Həzmdir. Bununla yanaşı, Əbu Muhəmməd insanların ən biliklisidir. Yalnız səhih hesab etdiyi ilə dəlil gətirər**".[24]

**5. İbn Xüzeymə.**

Onun rəvayətini qeyd etmişdik. O, "ət-Tohid" kitabının müqəddiməsində səhih olan hədisləri qeyd edəcəyini şərt kəsmişdir.

**6. Vəhabi şeyxi olan Salman bin Səhman Nəcdi.**

O, "əz-Ziyaul-Cəşariqu fi Rəddi Şubuhatil-Maziqil-Mariq" kitabında belə deyir: "**Onun "Allahın ərşdə qərar tutmasını, orada oturmaq mənasında olduğunu demir" sözlərinə gəlincə, cavab olaraq belə deyirik: "Möminlərin əmiri Ömər bin Xəttab (Allah ondan razı olsun) bu barədə nəql etmişdir. Allah onun dili ilə haqqı bəyan etmişdir. Necə ki, İmam Abdullah bin İmam Əhməd bin Hənbəl cəhəmiyyəyə cavab olaraq yazdığı "əs-Sunnə" kitabında həmin hədisi nəql etmişdir: "Atam və Əbdüləla bin Həmmad Nərsi belə demişlər: "Əbdürrəhman bin Məhdi, Süfyandan, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da**

---

[24] "Təlbisul-Cəhəmiyyə", c. 3, səh. 257.

**Ömərdən belə nəql etmişdir: "Allah-taala kürsünün üzərində oturduqda, onun səsi yeni yəhərin səsi kimi eşidilər**".

Sifətlər barədə olan digər hədislər kimi Əbu İshaq Səbii bu hədisi təsdiqləyərək nəql etmişdir. Süfyan Sovri də bu hədisi nəql etmişdir. Həmçinin, Əbu Əhməd Zübeyri, Muhəmməd bin Əbu Bəkr və Vəki bu hədisi İsraildən nəql etmişlər. Əbu Əbdürrəhman Abdullah bin Hənbəl öz atasından, o, Vəkidən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərdən (Allah ondan razı olsun) bu hədisi nəql edərkən "**Rəbb kürsüdə oturduqda**" (dedikdə) Vəkinin yanında olan bir şəxs ürpəndi. Atam onun adını demişdi. Vəki qəzəbləndi və belə dedi: "**Əməş və Süfyanın bu hədisləri nəql etdikləri və inkar etmədiklərinə şahid olmuşuq**".

Mən deyirəm: "**Bu hədis bəzi hədis alimlərinin nəzərində səhihdir. Hədis hafizi olan Ziyauddin Müqəddəsi bu hədisi qeyd etmişdir. Əgər Əbu İshaq Səbii, Sovri, Əməş, İsrail, Əbdürrəhman bin Məhdi, Əbu Əhməd Zübeyri, Vəki, Əhməd bin Hənbəl (adlarını çəkmək uzun olacaq) və hidayət çırağı, zülmətə işıq saçan başqa imamlar bu hədisi qəbul etmiş, nəql etmiş, inkar etməmiş və hədisin sənədinə nöqsan tutmamışlar. Biz kimik ki, onların üstünə çıxaq?! Əksinə, biz də buna iman gətiririk**". [25]

[25] "əz-Ziyaul-Məşariqu fi Rəddi Şubuhatil-Maziqil-Mariq", səh. 177.

**7. Sələfilərin (vəhhabilərin) məşhur hədis alimi Nasiruddin Albani.**

Ələvi bin Əbdülqadir Səqqaf "Sifatullahi əzzə və cəllə əl-Varidə fil-Kitəbi vəs-Sunnə" kitabında belə deyir: "**Əbu Musa Əşəri (Allah ondan razı olsun) belə deyir: "Kürsü iki ayağın yeridir. Onun yəhərin səsi kimi səsi vardır**". Abdullah bin İmam Əhməd "əs-Sunnə", Əbüşşeyx "əl-Muəzzəmə", İbn Əbu Şeybə "əl-Ərş" kitabında, İbn Cərir, Beyhəqi və başqaları bu hədisi nəql etmişlər. Albani (Allah ona rəhmət etsin) "Muxtəsərul-Uluvvu" kitabının 123-124-cü səhifələrində hədisin sənədinin səhih olmasını demişdir". Səqqaf da onunla müvafiqdir". [26]

**8. Hədis hafizi olan Zəhəbi.**

O, "əl-Ərş" kitabında belə deyir: "Əbu Əbdürrəhman Abdullah bin Əhməd bin Hənbəl "əs-Sunnə vər-Rəddu aləl-Cəhəmiyyə" kitabında atasından, o, Əbdürrəhman bin Məhdidən, o, Süfyan Sovridən, o, Əbu İshaq Səbiidən, o, Abdullah bin Xəlifədən, o da Ömərdən belə nəql etmişdir: "**Rəbb kürsünün üzərində oturduqda, onun (kürsünün) səsi yeni yəhərin səsi kimi eşidilər**".

Həmçinin, atasından, o, Vəkidən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərdən (Allah ondan razı olsun) bu hədisi nəql edərkən "**Rəbb kürsüdə oturduqda**" sözündən Vəkinin yanında olan bir şəxs ürpəndi. Atam onun adını demişdi. Vəki qəzəbləndi və belə dedi:

---

[26] "Sifatullahi əzzə və cəllə əl-Varidətu fil-Kitabi vəs-Sunnə", səh. 173, 174.

“**Əməş və Süfyanın bu hədisləri nəql etdiyinə və inkar etmədiklərinə şahid olmuşuq**”.

Mən deyirəm: Bu hədis bir dəstə hədis alimlərinin nəzərində səhihdir. Hədis hafizi olan Ziyauddin Müqəddəsi bu hədisi səhih hesab etmişdir. Bu hədis İbn Hibbanın şərtinə uyğundur. Onun da qeyd etdiyini bilmirəm. Onun nəzərində ədalətli hədis hafizi nöqsanı bilinməyən birindən hədis nəql edərsə, həmin hədis səhihdir. Əgər Əbu İshaq Səbii, Sovri, Əməş, İsrail, Əbdürrəhman bin Məhdi, Əbu Əhməd Zübeyri, Vəki, Əhməd bin Hənbəl (adlarını sadalamaq uzun olacaq), hidayət çırağı və zülmətə işıq saçan digər imamlar bu hədisi qəbul etmiş, nəql etmiş, inkar etməmiş və hədisin sənədinə nöqsan tutmamışlarsa, biz kimik ki, onların üstünə çıxaq? Əksinə, biz də buna iman gətiririk və elmini Allah-taalaya həvalə edirik”.

İmam Əhməd belə deyib: “**Nöqsanlı olduğu düşünüldüyü və qulaqlara xoş gəlməsə də, Rəbbimizdən hər-hansı sifəti inkar etmərik**”. **Elm və fəzilətdə Süfyan Sovrinin xələfi olan Vəki bin Cəraha, şöhrət və doğruluqda ona bənzəyirdi. O, necə də həmin adama etiraz etdi, bu hədisə görə onun halının dəyişməsini görüb qəzəbləndi**”. [27]

**9. Hədis hafizi olan Əbu Davud.**

Onun nəql etdiyi rəvayəti və rəvayətlə bağlı qeydləri barədə əvvəlki səhifələrdə danışmışıq. O, belə deyir: “**Bu hədis Əhməd bin Səidin sənədi ilə səhihdir. Yəhya bin Müin və Əli bin Mədəni kimi bir dəstə alim**

[27] “əl-Ərş”, c. 2, səh. 120, hədis 99. Təmiminin tədqiqi ilə.

**onunla (Əbu Davudla) razıdırlar. Əhmədin dediyi kimi, bir dəstə camaat İbn İshaqdan bu hədisi nəql etmişdir**".

**10. İmam, hafiz olan Mahmud Dəşti.**

O, "İsbatul-Həddi Lillahi əzzə və cəllə və bi Ənnəhu Qaidun və Calisun alə Ərşih" (Allah-taalanın həddinin olması və onun ərşin üstündə oturmasının isbatı) adlı kitabında geniş şəkildə danışmış, bu hədisi müdafiə etmiş və onu dəstəkləyən dəlilləri qeyd etmişdir. İki tədqiqatçı onun sözlərini tədqiq etmiş və bu hədisi səhih hesab edənlərin adlarını qeyd etmişlər. Növbəti səhifələrdə bu barədə qeyd edəcəyik.

Mahmud Dəşti adı çəkilən kitabında belə deyir[28]: "Əbu Rəbi Süleyman bin İbrahim Hibətullah bin Rəhmə Əsərdi, Əbu Muhəmməd Əbdülğəni Müqəddəsidən, o, Hafiz Əbu Musa Muhəmməd bin Əbu Bəkr bin Əbu İsa Mədini İsfahanidən, o, Əbu Mənsur Mahmud bin İsmail Seyrəfidən, o, Əbu Bəkr Muhəmməd bin Şazan Ərəcdən, o, Əbu Bəkr bin Furəkil-Qəbbabdan, o, Əbu Bəkr Əhməd bin Əmr bin Asimdən, o, Əbdüləla bin Həmmad Nərsi və Muhəmməd bin Müsənnadan, onlar da belə nəql edirlər: "Vəhəb bin Cərir atasından belə nəql edir: Muhəmməd bin İshaqın Yaqub bin Ətəbə və Cübeyr bin Muhəmməddən hədis nəql etdiklərini eşitdim. O, atasından, o da babasından belə nəql edir: "**Bir bədəvi ərəb Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu, canlar ölüm ayağında, əhl-əyal həlak, var-dövlət məhv, mal-qara isə həlak olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını**

---

[28] "İsbatul-Həddi Lillahi əzz və cəllə və bi Ənnəhu Qaidun və Calisun alə Ərşih", səh.136.

**istə. Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurdu: "Vay olsun sənə! Nə danışdığını bilirsənmi?!". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) zikr etdi. O qədər zikr etdi ki, səhabələrin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: "Vay olsun sənə! Allah yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allahın şəni bundan daha böyükdür. Vay olsun sənə! Bilirsən Allah-taala kimdir? Onun ərşi göyləri və yerinin üstündədir". Barmaqları ilə işarə edərək "gümbəz kimidir" dedi. Sonra belə buyurdu: "O (ərş) üzərindəki yükə görə yəhərdən çıxan səs kimi səs çıxardır**".

Buxari özünün tarix, Əbu Davud isə "Sunən" kitabında bu hədisi nəql etmişdir.

Əbdürrəhman bin Muhəmməd bin Əhməd Müqəddəsi, Qazi Əbulməcd Muhəmməd bin Hüseyn bin Əhməd Qəzvinidən, o, Əbülmənsur Muhəmməd bin Əsəd bin Muhəmməd bin Həfədə Ütarididən, o, imam, hafiz Əbu Muhəmməd Hüseyn bin Məsud Bəğəvidən (Allah ona rəhmət etsin), o, Əbu Əli Hüseyn bin Muhəmməddən, o, Əbu Nəim bin Həsən İsfirayinidən, o, atasının dayısı Əbu Əvanə Yaqub Hafizdən, o, Əbüləzhər Əhməd bin Əzhərdən, o, Vəhəb bin Cərirdən, o da atasından belə nəql edir: "Muhəmməd bin İshaqın Yaqub bin Ətəbə və Cübeyr bin Muhəmməd bin Cübeyr bin Mütimdən hədis nəql etdiyini eşitdim. O, atasından, o da babasından belə nəql edir: "**Bir bədəvi ərəb Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu, canlar ölüm ayağında, əhl-əyal ac, var-dövlət məhv, mal-qara isə həlak**

**olmaqdadır. Rəbbindən bizim üçün yağış yağdırmasını istə. Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) "Sübhanallah! Sübhanallah!" - dedi. (Peyğəmbər) o qədər zikr etdi ki, səhabələrin çöhrələrində nigaranlıq özünü biruzə verdi və sonra belə buyurdu: "Vay olsun sənə! Bilirsən Allah-taala kimdir? Onun şəni bundan böyükdür. Allah mənim yanımda şəfaətçi edilməz. O, göylərinin və yerinin üstündə - ərşi üzərindədir. O, ərşinin üzərində bu cürdür". Vəhəb barmaqları ilə işarə edərək "gümbəz kimidir" göstərdi. Əbüləzhər də işarə edərək belə dedi: "O (ərş, üzərindəki yükə görə yəhərdən çıxan səs kimi səs çıxardır**".

Əbu Muhəmməd Bəğəvi belə deyir: "Bu hədisi Əbu Davud Süleyman bin Əşəs cəhəmiyyə və mötəziliyə cavab verərkən qeyd etmişdir. Hədisdə "**onun (ərşin) səsi çıxır**" sözünün mənası budur ki, Allahın əzəmət və calalı qarşısında ərş aciz olduğu üçün yəhər səsi kimi səs çıxardır. Məlumdur ki, yəhər üzərindəki yükün ağırlığının gücündən aciz olduğu üçün səs çıxardır".

Hafiz Əbu Abdullah Müqəddəsi Muhəmməd bin Əbdülvahid xəbər verir ki, Abdullah bin Dehbəl bin Əli bin Karih Hərimi deyir ki, Ğalib Əhməd bin Həsən bin Əhməd bin Əlbənanın Bağdadda onlara belə xəbər vermişdir: Həsən bin Cövhəri Muhəmməd bin Müzəffər bin Musa Hafizdən, o, Muhəmməd bin Əhməd bin Müxəlləd Qazidən, o, Səid bin Muhəmməddən, o, Səlim bin Qüteybədən, o, Şöbədən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o, Ömər bin Xəttabdan, o da Peyğəmbərdən (sallallahu əleyhi və alihi və səlləm) "**Rəhman olan Allah ərşdə qərar tutdu**" ayəsinin barəsində

belə dediyini nəql etmişdir: “**Yəhərdən çıxan səs kimi ondan səs çıxar**”. Bu, səhih hədisdir. Raviləri Buxari və Müslimin şərtlərinə müvafiqdir.

Əbu Abdullah bizə xəbər verdi ki, Əbu Müslim Müəyyəd bin Əhməd bin İxvə İsfahanda xəbər verdi ki, Hüseyn bin Əbdülməlik Xəllaf İbrahim bin Mənsurdan, o, Yəhya bin Əbu Bükeyrdən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərdən belə nəql edir: “**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: “Allaha dua et ki, məni Cənnətə daxil etsin”. (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: “Onun kürsüsü yeddi göy və yerin üstündədir. Üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**”.

Əbu Abdullah bizə xəbər verdi ki, Əbu Cəfər Muhəmməd bin Əhməd bin Nəsr bin Əbülfəth bizə xəbər verdi ki, İsfahanda - yanında olarkən ona dedim: “Mahmud bin İsmail Səyrəfi sizə nəql etmişdir və sən də onun yanında idin. Muhəmməd bin Abdullah bin Şazandan, o, Abdullah bin Muhəmməd Qəbbabdan, o, Əhməd bin Əmr bin Əbu Asimdən, o, İsmail bin Salim Sayiğdən, o, Yəhya bin Əbu Bükeyrdən, o, İsraildən, o, Əbu İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərin belə dediyini nəql edir: “**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: “Allaha dua et ki, məni Cənnətə daxil etsin”. (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: “Onun ərşi yeddi göyün üstündədir. Üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**”.

Yusif bin Xəlil Əbu Mənsurdan, o, Əbülhəsəndən, o, Əbülqasimdən, o, Əbu Abdullah bin Bəttadan, o, Əbu Bəkr bin Salmandan, o, Muhəmməd bin

Abdullah Həzrəmidən, o, Abdullah bin Həkəm və Osmandan onların belə dediklərini nəql edir: "Yəhya İsraildən, o, Əbu İshaqdan, o, İbn Xəlifədən, o da Ömərdən belə nəql edir: "**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Allaha dua et ki, məni Cənnətə daxil etsin". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: "Onun kürsüsü yeddi göyü və yeri əhatə etmişdir. O (Allah) onun üzərində oturur və ondan (kürsüdən) dörd barmaq kənara çıxır. Sonra barmaqlarını bir yerə cəm edib göstərdi. Üstündə oturduqda üzərinə qoulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".

Bu, səhih hədisdir, raviləri isə Buxari və Müslimin şərtlərinə müvafiqdir.

Bu (Allahın ərşin üzərində oturması), Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) buyurduğu kimidir, mənası isə Onun şəninə layiqdir. Bu məsələni nə öz rəylərimizlə təvil edir, nə də xəyalımızla təsəvvür edirik. Müsəlmanların imamlarından olan əksər alimlər bu hədisi səhih hədislərin toplusu məqsədilə yazdıqları kitablarında qeyd etmişlər. Onlar bu hədisin ravilərini etibarlı hesab etmişlər. Bu hədisi nəql edənlərdən İmam Əhməd bin Hənbəl, Əbu Bəkr Xəllal, onun yoldaşı Əbu Bəkr Əziz və Əbu Abdullah bin Bəttanı qeyd edə bilərik.

Bu hədisi Əbu Muhəmməd Xəllal "əs-Sifat" kitabında qeyd etmişdir. Həmçinin, Əbülhəsən Darqutni sifətlər barədə yazdığı kitabda bu hədisi qeyd etmiş, nəqlolunma yollarını tənzimləmiş və ravilərinin ədalətini qorumuşdur. Darqutni hədis alimləri və Şafeinin yoldaşlarından idi.

Əbülhəsən Zağuni bir kitabında bu hədisi qeyd etmişdir. O, bəzi əsərlərində belə deyib: "**Bu hədisi bu kitabdan başqa kitablarda da qeyd**

**etmişəm. Bu hədisi yalnız inadkarlıq edərək rədd etmək olar. Onun səhihliyinə yalnız təkəbbürlük etməklə qarşı çıxmaq olar**". Bu hədisi şeyximiz Əbu Abdullah Müqəddəsi "əl-Musnədus-Səhih" kitabında qeyd etmişdir. Ondan başqa imamlar və hafizlər də qeyd etmişlər.

Şafei deyib: "**Bu hədis zahiri mənasındadır. Əgər başqa mənalar ehtimal olunarsa, zahirinə uyğun olan daha doğrudur**". Bu və bu kimi Allah-taalanın sifətləri barədə olan ayə və hədislər barədə Şafeinin dediyi rəydəyik. Müsəlmanların bütün imamlarının heç bir ixtilaf olmadan rəyləri məhz budur. O, belə demişdir: "**Əbu Bəkr bin Salman Mahmud bin Cəfərdən, o, Əbu Bəkr Mərvəzidən, o, Əbu Abdullah - yəni İmam Əhməd bin Hənbəldən, o, Həsən bin Musa Üşeybdən, o, Həmmaddan, o, Əta bin Saibdən, o da Şəbinin belə dediyini nəql edir: "Allah-taala ərşi tamamilə doldurmuşdur. Hətta ərşin yeni yəhərdən çıxan səs kimi səsi olacaqdır**".

Əbu Abdullah Muhəmməd bin Əbdülhəqq bin Xələf Dəməşqi bizə xəbər verib ki, Əbu Zürə Ləftəvani Übeydullah bin Muhəmməd bin Şücə İsfahandan bizə belə yazdı: "Əbu Rəbi Süleyman bin İbrahim bin Hibətullah Əsərdi Hafiz Əbu Muhəmməd Əbdülğəni bin Əbdülvahid Müqəddəsidən, o, Əbu Bəkr Muhəmməd bin Əbu Nəsr Qasani və Əbütteyb Ləftəvani Muhəmməd bin Muhəmməd bin Şücanın belə dediklərini nəql etmişdir: Əbu Abdullah Hüseyn bin Abdullah Xəllal Əbu Müzəffər Abdullah bin Şəbib Muqridən, o da Əbu Ömər Abdullah bin Muhəmməd bin Əbdülvəhhabdan.

Hafiz Əbdülğəni deyir: "Əbülğanim Turk Mahmud bin Əhməd İsfahani bunu bizə xəbər vermişdir: Əbu Tahir Xəfiy bin Fəzl Səffar Əbu Ömər

Abdullah bin Muhəmməd bin Muhəmməd bin Əbdülvəhhab bin Hafiz Əbu Abdullah bin Mundədən, o da atasından; Əbu Ömər Abdullah bin Muhəmməd bin Əbdülvəhab da onun icazəsiylə belə nəql edirlər: Əbülhəsən Əhməd bin Muhəmməd bin Ömər bin Əban Əbdi Lübnani Əbu Əbdürrəhman Abdullah bin Əhməd bin Hənbəldən belə nəql edir: “**Atamdan kürsü və Uca Rəbbin onun üzərində oturması məsələsində nəql olunanlar barədə soruşdular. Atamın (Allah ondan razı olsun) bu hədisləri səhih hesab etdiyini gördüm. O, görmək barədə olan (Allahı görmək barədə) hədisləri qəbul edirdi. Həmin hədisləri bir kitabda toplamış və bizə nəql etmişdir. Allah ondan razı olsun**”.

Həmçinin belə demişdir: “Atam mənə Əbdüssəməd bin Əbdülvaris və Muhəmməd bin Cəhadədən, o, Səlmə bin Küheyldən, o, Ümarə bin Ümeyrdən, o da Əbu Musadan belə nəql edir: “**Kürsü iki ayağın yeridir. Onun yəhərin səsi kimi səsi vardır**”. Abdullah belə demişdir: “Atam və Əbdüləla bin Həmmad Nərsi mənə nəql etmişlər: Əbdürrəhman bin Məhdi Süfyandan, o, İshaqdan, o, Abdullah bin Xəlifədən, o da Ömərdən belə nəql edir: “**Allah-taala kürsüdə oturduqda yeni yəhərdən çıxan səs kimi kürsünün səsi eşidilər**”.

Abdullah belə demişdir: “Atam mənə Vəkidən İsrailin Əbu İshaqdan, onun Abdullah bin Xəlifədən, onun da Ömərdən nəql etdiyi hədisi nəql etmişdir: (Ömərin nəql etdiyi): “**Uca Rəbb kürsüdə oturduqda**” (hədisini eşitdikdə) Vəkinin yanında olan bir kişi ürpəndi. Vəki qəzəbləndi və belə dedi: “**Əməş və Süfyanın bu hədisləri nəql etdiyinə və inkar etmədiklərinə şahid olmuşuq**”.

Abdullah belə demişdir: "Atam mənə Əbülmüğirədən, o, Əbdə binti Xalid bin Mədandan, o da atası Xaliddən belə nəql etmişdir: "**Müşriklərin qalxdığı gündüzün əvvəlindən ta zikr edənlərin qalxmasınadək Rəhman olan Allah-taala ərşi daşıyanlara ağırlıq edər. Sonra ərşi daşıyanların yükü yüngülləşdirilər**".

**11. Hədis hafizi olan Müqəddəsi.**

Əvvəlki səhifələrdə onun nəql etdiyi hədisi qeyd etmişik. O, həmin hədislərin sənədlərinin həsən olduğunu demişdir. O, kitablarında yalnız mötəbər hədisləri qeyd etmişdir.

**12. Hakim Nişapuri.**

Əvvəlki səhifələrdə onun nəql etdiyi hədisi qeyd etmişik. O, hədisin sonunda "**Bu, sənədi səhih olan hədisdir**" demişdir.

**13. Doktor Əli bin Muhəmməd bin Nasir Fəqihi.**

O, Hədis hafizi olan İbn Mündə Müqəddəsinin "ər-Rəddu aləl-Cəhəmiyyə"[29] kitabını tədqiq edərkən "Ərşin səsi" hədisi barədə belə demişdir: "**İbn Cərir Təbəri, "ət-Təfsir", 3-cü cild, 10-cu səhifə. Əli bin Müslim bin Səid Tusinin yolu ilə nəql olunmuşdur. Sənədi həsəndir**".[30]

---

[29] "ər-Rəddu aləl-Cəhəmiyyə", səh. 46.

[30] Həmin mənbə, haşiyə, səh. 140.

**14. Şeyx Müsəllit Ətibi və Şeyx Adil Ali-Həmdan.**

Dəştinin "İsbatul-Həddi Lillahi əzz və cəllə və bi Ənnəhu Qaidun və Calisun alə Ərşih" kitabının tədqiqində belə demişlər: "**Ərşin səsi" hədisinin hökmü: "Əhli-Sünnə ərşin hədisinə əsasən dəlil gətirmiş, sünnə və etiqad mövzusunda yazdıqları kitablarda bu hədisi qəbul etdiklərini və onunla dəlil gətirdiklərini bəyan etmişlər**".

**15. Əbülhüseyn Mələti Şafei.**

O, "ət-Tənbih vər-Rəddu alə Əhlil-Əhvai vəl-Bidəi" kitabında belə deyir: "**İbn Məsuddan belə nəql olunur: "Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) belə buyurub: "Mən məqamul-mahmudda dayanacam". "Ona (Peyğəmbərə) "məqamul-mahmud nədir?" – deyə soruşdular? (Peyğəmbər) buyurdu: "O, həmin gündür ki, Allah (öz) kürsüsünün üstünə enər. Kürsüdən göylə yer arasında yəhər (üzərindəki yükün ağırlığından) səs çıxartdığı kimi səs çıxar**".[31]

**Fayda:** Tədqiqatçı, Professor Muhəmməd Zerəb kitabın müqəddiməsində bu şəxsin təcsim bataqlığına qərq olduğuna işarə edir: "**Mələti təfsirdə Müqatil bin Süleymana istinad etdiyi üçün onu "istiva"-nı "oturmaq" mənasında təfsir etmək kimi həşəviyyənin bəzi rəyləri ilə aldatmışdır. Baxmayaraq ki, bundan əvvəl onun özünün**

[31] "ət-Tənbih vər-Rəddu alə Əhlil-Əhvai vəl-Bidəi", səh. Məhəmməd Zərəbin tədqiqi.

**əqidəsi sabit deyildir. Aləmlərin Rəbbi cisimlilik və yaranmışların sifətlərindən uca və pakdır**”.[32]

**16. Şeyx Əbdüllətif bin Əbdürrəhman.**

O, Muhəmməd bin Ovna yazdığı məktubda belə deyir: “**Sübuta yetmişdir ki, (Peyğəmbər) ona “Biz səni Allahın yanında, Allahı da sənin yanında şəfaətçi edirik” deyən şəxsə belə demişdir: “Allahu əkbər! Allahu əkbər! Allahın şəni bundan daha böyükdür! Vay olsun sənə! Heç bilirsən Allah kimdir? O ərşinin üzərindədir”. Əlləri ilə gümbəz kimi göstərdi. “O (ərş) üzərindəki yükə görə yeni yəhərdən çıxan səs kimi səs çıxardır”. Cəhəmidən olan kəs bu hədisi eşitməyi belə qəbul edə bilmir. Bu hədisə yalnız Allahı kamal sifətləri ilə tanıyan və Onun əzəmətini bilən Əhli-Sünnə vəl-Cəmaə iman gətirir. Özünü ərşdə qərar tutması kimi vəsf etdiyindən başqa heç bir sifət onun şəninə layiq deyildir. (Əhli-Sünnə vəl-Cəmaə) digər məxluqları kimi kamilliyi və qüdsünə layiq olmayan mənada olan oturmasını Ondan uzaq bilmişlər**”.[33]

**17. Abdullah bin Əbdürrəhman bin Abdullah Cibrin.**

O, “ər-Riyazun-Nədiyyə alə Şərhil-Əqidətit-Tahaviyyə” kitabında belə deyir: “**Sonra Allah-taalanın ərşin üzərində olduğunu deyir. Ərş Onun ağırlığından yəhər kimi səs çıxardır. Bu, “təzim” və ya “bəyan”**

[32] “əl-Muqəddimə”, səh. 3.

[33] “əd-Durərus-Səniyyə fil-Əcvibətin-Nəcdiyyə”, c. 3, səh. 300. Əbdürrəhman Qasimin tədqiqi ilə.

**babındandır - yəni Allah-taala ərşin üzərindədir. Ərşin əzəməti, böyüklüyü və məxluqları əhatə etməsiylə yanaşı, ondan yəhər səsi çıxır. Bunun Rəbbin ağırlığından olduğu deyilir. Allah-taala ərşin daşınan olmasını buyurmuşdur. Ərşi daşıyanlar öz gücləri ilə deyil, Rəbblərinin gücü ilə onu daşıyırlar, lakin bu, "əzəmət və böyüklüyü bəyan etmək" babındandır**".[34]

Həmçinin belə deyir:

"**Bəzi bidətçilərin "Şura" surəsinin "Göylər az qalır yuxarılarından yarılsın..."[35] ayəsinə əsaslanan və etiqada müxalif olan söz danışıb hədis nəql etdikdə mən də onlara bir hədis oxudum: İbn Abbasdan (Allah ondan razı olsun) belə nəql olunur: "Az qala Rəbbin ağırlığından göylər yarılsın". Bu söz bu cəhəmi əqidəsində olana çox ağır gəldi və belə dedi: "(Göylər Allahın) heybətindən yarılacaq". Bax, gör necə də mətni zahiri mənasından fərqli mənaya yozur və məqsədin heybət olduğunu deyir, çünki o, Allah-taalanın göylərin üzərində olduğuna, göylərin Onun ağırlığından yarıldığına inanmır. Həmçinin, o, hədisdə qeyd olunduğu ərşin yəhər səsi kimi səs çıxartmasını da təkzib edir**". [36]

**18. Şeyx Saleh Fovzan.**

O, "ət-Təliqul-Muxtəsəru aləl-Qəsidətin-Nuniyyə" kitabında belə deyir: "**Ərş əzəmət və böyüklüyü ilə yanaşı Rəhmanın (Allahın) ağırlığından**

---

[34] "ər-Riyazun-Nədiyyə alə Şərhil-Əqidətit-Tahaviyyə", c. 3, səh. 37.

[35] "Şura" surəsi, ayə 5.

[36] Həmin mənbə, səh. 39.

**yəhər kimi səs çıxardır. Bu, hədisdə qeyd olunduğu kimi Rəbbin əzəmətinə dəlalət edir**”. [37]

Həmçinin belə deyir:

“**Həmin hədisdə (Peyğəmbər) özü xəbər verir ki, ərş Allahın əzəməti və onun (ərşin) üstündə qərar tutmasından səs çıxardır. Yəhərdən səs çıxdığı kimi ərşdən də səs çıxır. Baxmayaraq ki, ərş məxluqların ən əzəmətlisidir. Deməli, bu, Allahın əzəmətinə dəlalət edir. Kim belə olarsa, Onu yaratdıqları zəif məxluqların yanında şəfaətçi etmək olmaz**”.[38]

**19. Təfsir alimi olan İbn Cərir Təbəri.**

O, öz təfsirində belə deyir: “**Əbu Cəfər belə deyir: “Bu rəylərin hər biri müəyyən bir məzhəbə aiddir, lakin ayənin təvilinə ən yaxşı olan Allah rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) nəql olunan hədisdir. Həmin hədis Abdullah bin Əbu Ziyad Qətvaninin mənə nəql etdiyi hədisdir. O, belə nəql edir**: “Übeydullah bin Musa İsraildən, o, Əbu İshaqdan, o da Abdullah bin Xəlifədən belə nəql edir: “**Bir qadın Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: “Allaha dua et ki, məni Cənnətə daxil etsin”. (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: “Onun kürsüsü göyləri və yeri əhatə etmişdir. O (Allah), onun üzərində oturur və ondan (ərşdən) dörd barmaq kənara çıxır”. Sonra barmaqlarını bir yerə cəm edib göstərdi.**

---

[37] “ət-Təliqul-Muxtəsəru aləl-Qəsidətin-Nuniyyə”, c. 1, səh. 127.

[38] Həmin mənbə, c. 2, səh. 443.

**"Üstündə oturduqda üzərinə qoulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".[39]

**20. İbn Bəttə Əkbəri.**

O, "əl-İbanəs-Suğra" kitabında belə deyir: "**Alimlər və hədis əhlindən etibarlı olanların Allah rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) nəql etdikləri bütün rəvayətlərə iman gətirmək, qəbul etmək və təsdiqləmək lazımdır. Həmin rəvayətlər rədd edilməz, "nə üçün?" və "necə?" deyilməz, ağılla yozulmaz, heç nə ilə müqayisə edilməz. Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm), yaxud da özü şifa və dəlil olan ümmət alimlərinin təfsir etmədiyi kimi təfsir edilməməlidir. Məsələn: Sifətlər və görmək barədə olan hədislər kimi. Aşağıda nəql olunan rəvayətlər həmin qəbildəndir:**

**280.** "**Allah-taala göyləri bir barmağında, yerləri isə başqa barmağında tutacaq**".

**281.** "**Allah ayağını cəhənnəm oduna qoyub deyəcək: "Kifayətdir! Kifayətdir!**".

**282.** "**Bəndələrin qəlbləri Rəhmanın (Allahın) iki barmağı arasındadır**".

**283.** "**Allah-taala ərşin üzərindədir. Ərşin yeni yəhərin səsi kimi səsi vardır**".[40]

---

[39] "Təfsiri Təbəri", c. 4, səh. 539, 540.

[40] "əl-İbanəs-Suğra", səh. 142, 143. Adil Ali-Həmdanın tədqiqi ilə.

**21. Şeyx, Doktor Muhəmməd Xəlil Hiras.**

O, "Şərhul-Qəsidətin-Nuniyyə" kitabında belə deyir: "**Onun sözünə (hədisi qeyd edir) gəlincə, bu, İbn İshaqın nəql etdiyi hədisə işarədir: "Bir bədəvi Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) yanına gəlib dedi: "Ey Allahın rəsulu! Canlar ölüm ayağında, əhl-əyal həlak olmaqda, bədənlər qurumaqda, mal-dövlət isə məhv olmaqdadır. Allahdan bizim üçün yağış yağdırmasını istə! Biz səni Allah-taalanın yanında, Allahı da sənin yanında şəfaətçi edirik". Allah rəsulu (sallallahu əleyhi və alihi və səlləm) zikr etməyə başladı. O qədər zikr etdi ki, səhabələrin çöhrələrində nigaranlıq özünü biruzə verdi. Sonra Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurdu: "Vay olsun sənə! Bilirsənmi Allah kimidir? Allah öz yaratdıqlarından heç kimin yanında şəfaətçi edilməz. Allah-taalanın şəni bundan daha böyükdür". Sonra bu hədisi nəql etmişdir: "Səma ilə yeddinci səma arasında səmalar, sonra ərşdir. Allah (öz) ərşinin üzərində oturmuşdur. Üzərində oturduqda ərşdən tələsən şəxsin üzərində oturduğu yəhərdən çıxan səs kimi səs çıxır**".[41]

**22. Bu hədisi nəql edənlərdən digərləri isə aşağıdakılardır:**

Dəştinin kitabına haşiyə yazanlar bu hədisi səhih hesab edənlərdən bəzilərinin adlarını qeyd etmişlər. Onlar aşağıdakılardır:

1. Muhəmməd bin İsmail Buxari. 2. Osman bin Səid Darami. 3. Əbu Davud. 4. İbn Xüzeymə. 5. Əbu Əvanə. 6. İbn Bəttə. 7. İbn Mündə. 8.

[41] "Şərhul-Qəsidətin-Nuniyyə", c. 1, səh. 277.

Übeydullah bin Səid Səczi. 9. Hüseyn bin Məsud Bəğəvi. 10. İbn Zağuni. 11. Dəşti. 12. İbn Teymiyyə. 13. İbn Qəyyim. 14. Heysəmi. 15. Muhəmməd bin Əbdülvəhab. 16. Əbdüllətif Əbdürrəhman (Dəştinin kitabının haşiyəsi, 141 və 154-cü səhifəyə. Orada bu məsələ barədə uzun-uzadı danışmışdır.

## Dördüncü mövzu: Müsəlmanların bu qondarma hədisdən uzaq olmaları.

Bu hədis təcsim əqidəsinə etiqad bəsləyənlərin ən çirkin hədislərindəndir. Bu hədisə əsasən Allah-taala ərşin üzərində oturur. Onun ağırlığından ərşdən yəhər səsi kimi səs çıxır. Bu, batil rəydir. Bunu yalnız fasid əqidənin daşıyıcıları olan mücəssəmədən (təcsimə etiqad edənlər) başqa heç kim deməz. Bu mətnin batilliyi aşağıdakı məsələlərdə öz əksini tapır:

1. Həqiqi mənada təzyiq edən ağırlıq maddənin ibarət olduğu sıxlıqdandır. Sübut olunmuşdur ki, Allah-taala maddə və ümimiyyətlə, cisim deyildir.

2. Ərşin üzərində oturmaq kamillik sifətlərindən deyildir. Allah-taala belə bir əbəs işdən ehtiyacsızdır. Vücudu vacib olan öz zatı ilə zəngin və ehtiyacsızdır. Təcsim əqidəsində olan və başqa azğın təriqətlərin etiqad etdiyi kimi üzərində oturmaq üçün ərş və kürsüyə ehtiyacı yoxdur. Bundan əlavə, təvilə inananlar bu cəfəngiyyatlardan uzaq olduqlarını bəyan etmiş və bu babda nəql olunan ərşin səsini "Allahın əzəməti və cəlalından irəli gələn səs" kimi yozmuşlar. Bu, əşərilərin məsləyinə münasibdir, lakin təcsim əqidəsində olanlar təvili inkar edirlər. Bu hədis Allah-taalanın ağırlığının olmasını isbat edir. Mötəbər dini mətnlər bunu qəbul etmir, ağıl isə inkar edir. Bu mənanı təcsim əqidəsində olanlar və Allaha naqislik nisbət verən əhli-kitabdan (yəhudi və xristianlardan) başqa heç kim qəbul etmir. Allah-taala zalımların dediklərindən uca və pakdır.

Ayətullahul-Üzma Şeyx Cəfər Sübhani (kölgəsi əskik olmasın) bu hədisin mətni barədə belə deyir: "**Bu hədisin mənası göründüyü kimi aşkar şəkildə təcsimə dəlalət edir, çünki bu hədisə görə:**

**Birinci:** Allah-taalaya məkan nisbət verilir. Həmin məkan ərşdir - bu isə Onun varlığının bütün yaradılış aləmindən ayrı olduğuna dəlalət edir.

**İkinci:** Yəhərin üzərində oturan şəxsin yəhərlə təmas etdiyi kimi Allah-taalanın ərşlə təmas etdiyini bəyan edir.

**Üçüncüsü:** Allah-taalaya maddənin xüsusiyyətlərindən olan sıxlıq xüsusiyyəti nisbət verilir. Onun ağırlığından yəhərin üzərində oturan şəxsin ağırlığına görə çıxan səs kimi ərşdən səs çıxır. Bu, yəhudilər və bütpərəstlərin inandıqları aşkar təcsimdir. Allah-taala bu sifətlərdən uca və pakdır".[42]

---

[42] "əl-Hədisun-Nəbəvi beynər-Rəvayəti vəd-Dirayəti", səh. 381.

# Beşinci mövzu: Müsəlmanların bu qondarma hədisdən uzaq olmaları.

Müsəlmanlar təcsim əqidəsində olanların islam əqidəsinə sırımaq istədikləri batil əqidəni inkar etmişlər. Əhli-Beyt (əleyhimussəlam) məktəbinin ardıcılları bu batil əqidəni rədd etmiş və islam əqidəsindən olmasını qəbul etməmişlər. Həmçinin, Əhli-Sünnə əqidəsində olan qardaşlarımızdan təcsim əqidəsinə müxalif olanlar da bu fikirdədirlər.

## İmamiyyə alimlərinin rəyləri

1. **Şeyx Muhəmməd Cavad Bəlaği**.

O, öz təfsir kitabında belə deyir:

"**Zahiri mənanı əsas götürənlərin nəql etdikləri qəribə rəvayətlərdən biri də İbn Mərdəveyhin, Xətibin "Tarix" əsərində, İbn Mənsurun öz "Sunən" kitabında nəql etdikləri Ömərin Peyğəmbərdən (sallallahu əleyhi və alihi və səlləm) "Rəhman olan Allah ərşdə qərar tutdu" ayəsi barədə belə buyurduğunu nəql etməsidir: "Ərşin yəhər səsi kimi səsi çıxacaq**".[43]

[43] "Alaur-Rəhman fi Təfsiril-Quran", c. 1, səh. 42.

**2. Seyid Təbatəbai.**

"əl-Mizan fi Təfsiril-Quran" kitabında belə deyir: "**Bu hədisin mətni xələldən xali deyildir. Biz onu sadəcə olaraq ərşin cisim olması barədə ən aşkar hədis olduğu üçün qeyd etdik**".[44]

**3. Şeyx Əli Kurani.**

Şeyx Əli Kurani "əl-Vəhabiyyətu vət-Tovhid" kitabında bu cür cəfəngiyyatları rədd edərək uzun-uzadı bəhs etmişdir.[45]

**4. Doktor Şeyx Əbdürrəsul Ğəffar.**

O, imamiyyə və qeyriləri arasındakı ixtilaflar barədə danışarkən belə deyir: "**Hənbəlilərdən olan müşəbbihə (ilahi sifətləri məxluqların sifətlərinə bənzədənlər) və hədis alimləri belə deyirlər: "O, başqa cisimlər kimi işarə olunacaq surətdə bilinir. O, ərşin üst hissəsinə təmas edir. Bir məkandan başqa məkana keçmək Onun üçün mümkündür. Ərş Onun ağırlığından ağır yükün altındakı yeni yəhərin səsi kimi səs çıxardır. Ərşin (üzərində oturduqda) hər tərəfindən dörd barmaq kənara çıxır. Bundan əlavə, deyirlər ki, axirətdə möminlər Onu qucaqlayacaqlar**".[46]

İmamiyyə İmam Sadiqdən (əleyhissəlam) nəql etdiklərini qəbul edir və inanırlar. Hədisdə belə deyilir: "**Davud Riqqi belə nəql edir: "Əbu**

[44] "əl-Mizan fi Təfsiril-Quran", c. 14, səh. 134.
[45] "əl-Vəhhabiyyətu vət-Tovhid", səh. 56.
[46] "əl-Kuleyni vəl-Kafi", səh. 56.

**Abdullahdan (İmam Sadiqdən) "... ərşi (taxtı) suyun üzərində olan halda..."[47] ayəsi barədə soruşdum. (İmam): "(Bu barədə) nə deyirlər? – deyə soruşdu. Mən: "Camaat deyir ki, ərş suyun üzərində, Rəbb isə ərşin üzərindədir" - dedim. (İmam) buyurdu: "Yalan deyirlər! Kim bunu iddia edərsə, Allahı daşınan qərar vermiş və Onu məxluqun sifətiylə vəsf etmişdir. O, daşıyanın daşınandan güclü olmasını qəbul etmişdir**".[48]

İmamiyyə alimlərinin Allah-taala barəsində cisimliliyi, məhdudluğu və keyfiyyəti inkar edən sözləri saysız-hesabsızdır. Bununla da, əziz oxucu bilməlidir ki, bizim (şiə) əqidəmizdə bu (cür) batil hədislərin yeri yoxdur.

**Əhli-Sünnə alimlərinin rəyləri:**

**1. İbn Covzi.**

İbn Covzi "Dəfu Şəbəhit-Təşbihi bi Əkuffit-Tənzih"[49] kitabında bu hədisi müzakirə etmişdir.

**2. Seyid Həsən Səqqaf.**

O, "Səhihu Şərhit-Tahaviyyə" kitabında belə deyir: "**Əbu Musanın hədisində "ərşin səsi" qeyd edilmişdir. Hədis hafizləri "Ərşin səsi"**

[47] "Hud" surəsi, ayə 7.
[48] "Usul əl-kafi", c. 1, səh. 133.
[49] "Dəfu Şəbəhit-Təşbihi bi Əkuffit-Tənzih", səh. 247.

**hədisinin səhih olmamasını demişlər. Təzadlar şeyxi (Albanini nəzərdə tutur) bu hədisi öz zəifində (zəif hədislər toplusunda) qeyd etmişdir**”.[50]

**3. Şeyx Səid Fovdudə.**

O, “əl-Kaşifus-Səğir ən Əqaidi İbn Teymiyyə” kitabında belə deyir: “**İbn Teymiyyə bu batil və boş hədislərlə göylərin kürə surətində olması və Allah-taalanın göylərin üstündə kürə kimi gümbəzin altındakını əhatə etməsi kimi əhatə etməsinə dəlil gətirmişdir. (Hədisdə qeyd olunan) “ətit” kəlməsi bir şeyin üzərinə ağır bir şey qoyulduqda baş verən səsdir. Sən hər-hansı stulun üzərinə ağır bir şey qoyulduqda stuldan səs çıxdığını eşidərsən. Sanki stul, üzərində olan yükün ağırlığından nalə edir. Bu səs “ətit” adlanır. Bu səs bir şeyin ağırlığından hasil olan səsdir. İbn Teymiyyənin “Allah-taala ərşin üzərində oturduqda onun ağırlığından hasil olan səs” barədə özünəməxsus sözü var, lakin burada həmin sözləri qeyd etməyə lüzum yoxdur**”.[51]

**4. Şeyx Əbu Hamid bin Məzruq.**

O, təcsim əqidəsində olan hənbəli məzhəbli Bərbəharinin bu hədisə etiqad bəsləməsini pisləmiş və bunu onun təcsim əqidəsinə etiqad bəsləməsinə dəlalət etdiyini demişdir.[52]

---

[50] “Səhihu Şərhit-Təhəviyyə”, səh. 447, 448.
[51] “əl-Kaşifus-Səğir ən Əqaidi İbn Teymiyyə”, səh. 379.
[52] “Bəraətul-Əşəriyyin min Əqaidil-Muxalifin”, c. 1, səh. 53, 54.

Həmçinin, qeyd etdiklərimizdən əlavə, başqa alimlər də bu hədisin yəhudi boyasında olduğunu demişlər. Növbəti səhifələrdə həmin alimləri də qeyd edəcəyik və sən bu yəhudi cəfəngiyyatını inkar etdiklərini biləcəksən.

## Altıncı mövzu: Rəy və izah

Bu təvazökar araşdırma və bu batil hədisi müzakirə etdikdən sonra qəti olaraq bu hədisin qondarma, Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) dilindən uydurulmuş bir yalan olduğunu deyir və bu hədis barədə qənaətə gəldiyim altı məsələni qeyd edirəm:

**1.** Bu hədis qondarma və yalandır. Əhli-Sünnənin rical elminin meyarlarının dəqiq və obyektiv hökm vermədiyinə inandığıma baxmayaraq, bu hədisin onların şərtlərinə əsasən səhih olmamasını hesab edirəm. Bu, həvayi-nəfsin adları çəkilən təcsim əqidəsinin alimlərinin elmi metodlarına nə dərəcədə müdaxilə etdiyinə dəlalət edir. Bu hədisin sənədi və mətninin nöqsanlı olmasına baxmayaraq, onlar bu hədisi müdafiə etmiş, səhih olduğu və hamı tərəfindən qəbul olunduğunu iddia etmiş və böyük imamların tərəfindən qəbul edildiyini demişlər. Necə ki, İbn Teymiyyə və təcsim əqidəsində olan ardıcılları belə etmişlər. Onlar bu hədisin mətninin səhih və məqbul olduğunu, alim və tədqiqatçıların etimad etdiyi dəlil olduğunu deyirlər. Onlar bu cəfəngiyyatları əsas tutaraq öz etiqadlarını dəstəkləyirlər.

**2.** Bu hədisi mütləq surətdə rədd edənlərin rəyi onu təvil edənlərin rəylərindən daha güclüdür. Hədisin mətnlərinin fərqli olmasını nəzərdən keçirdikdən sonra bu qərara gəldim ki, səsin Allahın ayələri, nemətləri və əzəmətindən hasil olduğunu demək münasib deyil, çünki hədisin mətnlərində ərşin üzərində oturmaqla ondan səs çıxması "səbəb-nəticə qanunu" kimi əlaqələndirilir. Səsin çıxması Allahın ərşin üzərində oturmasının nəticəsi kimi göstərilir. Bundan əlavə, hədisə əsasən ərşin

səsinin sifəti məlumdur - o yəhərin səsinə bənzəyir. Bu isə təşbihə daha münasibdir. Allaha pənah aparırıq!

a) "**Onun (Allahın) ərşi və ya kürsüsü göyləri və yeri əhatə etmişdir. O, ərşin üstündə oturur və ondan (ərşdən) dörd barmaq kənara çıxır. Üstündə oturduqda üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**". (Peyğəmbər) Allah-taalanı əzəmətli tutaraq belə buyurdu: "**Onun ərşi yeddi göyün üstündədir. (Ərşin üstündə oturduqda) üzərinə qoyulmuş yükün ağırlığından ərşdən yeni yəhərin səsi kimi səs çıxır**".

Bax, gör Müqəddəsi "əl-Əhadisul-Muxtara" kitabında nələr nəql edir?!

b) "Ona (Peyğəmbərə) "**məqamul-mahmud" nədir**?" - deyə soruşdular. (Peyğəmbər) belə buyurdu: "**O, həmin gündür ki, Allah-taala öz kürsüsünə enər. Göylə yer arasında yəhər (üzərindəki yükün ağırlığından) səs çıxartdığı kimi kürsüdən səs çıxar**". Bax, gör Əbüşşeyx İsfahani, Hakim Nişapuri və "Sunən" kitabının müəllifi olan Darami nələr nəql edirlər?! Həmçinin, Dəştinin nəql etdiyi və səhih hesab etdiyi bu hədisə nəzər sal: "**Onun ərşi göylərin və yerin üstündədir. (Ərşin üstündə oturduqda) ondan üzərinə qoyulmuş yükün ağırlığından yeni yəhərin səsi kimi səs çıxır**".

Bu hədisləri "**əzəmət**" və "**heybət**" mənasında təvil etmək (yozmaq) mümkün deyildir. Həmçinin, keyfiyyət olmadan və bənzədilmədən də demək olmaz, çünki hədisin mətnində "**yəhərin səsi**" kimi deyilməsiylə artıq keyfiyyət müəyyən edilmişdir. Hədisin mətni aşkar şəkildə bənzətməni

ehtiva edir və ərşin üzərində oturmaqla səsin çıxması arasında səbəb-nəticə əlaqəsinin olduğunu bəyan edir.

Bundan başqa, "**ərşin səsi**" Allahın sifəti deyil, ərşin xüsusiyyətidir. Buna əsasən də, burada keyfiyyəti inkar etməyin heç bir mənası yoxdur. Deməli, "**ərşin səsi**" sifəti öz həqiqi mənasında götürülməlidir. Bu səs yəhərin üzərində oturduqda çıxan səsə bənzəyir. Sən bilirsən ki, bu səs ağırlığı olan bir cismin təzyiqi nəticəsində yaranır. Hədis cisimliliyi aşkar şəkildə bəyan edir. Hədisin xülasəsi belədir:

**1)** "**Yəhər səsi**" ərşin həqiqi sifətidir. Bu səs ağır cismin təzyiqi nəticəsində yaranır.

**2)** Hədisdə deyildiyi kimi, səs Rəbbin oturması (Allaha pənah aparırıq) nəticəsində yaranır.

**3)** Oturan (hədisə əsasən - Allah) ağır maddədir. Buna görə də, səs oturduqdan sonra baş vermişdir.

**3.** Bu hədis əməvi mənşəlidir. İslam şəriəti bu hədisin məzmununu qəbul etmir, hətta bu hədis təcsim əqidəsində olanlardan başqa islam əhlinin ittifaqına da ziddir. Hədisin əməvi mənşəli olması "**Allah-taalanın (öz) yaratdıqlarından hər-hansı birinin yanında şəfaətçi edilməsindən daha böyükdür**". Bu söz əməvi metoduna münasibdir, çünki Mərvan bin Həkəm Allah rəsuluna (sallallahu əleyhi və alihi və səlləm) şəfaət etməyi qadağan etmişdir. Bəlkə də, məhz bu sözə görə İbn Teymiyyə bu hədisdən yapışmışdır. Bu hədis onun pak yaranmışlarla Allaha şəfaət və təvəssül etməyi qadağan edən məzhəbinə uyğundur. Məhz buna görə də, İbn

Teymiyyə hədisi qeyd edərkən bu məsələni müzakirə etməkdən yayınaraq belə demişdir: “**Hədisdə “yaratdıqlarından heç kim Allahın yanında şəfaətçi edilməz” sözündən məqsəd budur ki, Allah özü feil icra edir və bir işin icra edilməsi üçün Onu başqasına şəfaətçi, vasitə etmək olmaz. Necə ki, bəzi şairlər Peyğəmbərə (sallallahu əleyhi və alihi və sələm) xitab edərək belə deyirlər: “Sənə şəfaətçim Allahdır, başqası deyildir”.**

**4.** Hədisin batil olmasına dəlalət edən məsələlərdən biri də, “**yəhər səsi**” kimi səs çıxmasını aşkar şəkildə qeyd etməsidir. Bu səs xələl olan bir şeydən çıxır. Əgər kimsə stul aldıqdan sonra oturduqda ondan səs çıxarsa, həmin stulu düzəldəni qüsurda ittiham edər. Belə olan halda, hər şeyi ən gözəl biçimdə yaradan Allaha bunu necə nisbət vermək olar?!

**5.** Bu hədis təhrif olunmuş yəhudi dininin mətnlərinə bənzəyir. Şübhəsiz ki, yəhudilər islam ümmətinin seyrini mürtəceliyə doğru sürükləyən Bəni-Üməyyənin vasitəsilə onu İslam dininə daxil etmişlər. Yəhudi xəfiyyələri bunu əməvi cərəyanının hədisçilərinin əli ilə etmişlər. Bu rəyi təkcə biz demirik, hətta Əhli-Sünnə alimlərindən bəziləri də belə demiş və bu zəlalət dolu mətnin yəhudi əqidəsinə müvafiq olduğuna qəti surətdə əmin olduqlarını bildirmişlər. Bu hədisin əslində yəhudi qondarması olmasını deyən alimlərdən aşağıdakıların adlarını qeyd edə bilərik:

**a) Əbülfəth Şəhristani.**

O, “əl-Miləl vən-Nihəl” kitabında müşəbbəhə (ilahi sifətləri məxluqların sifətlərinə bənzədənlər) barədə belə deyir: “**Hədislərə qondarma yalanlar artırıb Peyğəmbərə (sallallahu əleyhi və alihi və**

**səlləm) nisbət vermişlər. Bu yalanların əksəriyyəti yəhudilərdən iqtibas edilmişdir, çünki təşbih onların əməllərindəndir. Hətta onlar belə demişlər: "(Allahın) gözləri ağrımış, mələklər Onu müalicə etmişlər. (Allah) Nuhun tufanı üçün o qədər ağlamışdır ki, gözləri şişmişdir. Ərş Onun altında dəmir yəhərin səsi kimi səs çıxardır. O, ərşdə oturduqda hər tərəfdən dörd barmaq kənara çıxır. Müşəbbihə Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) belə buyurduğunu nəql edirlər: "Rəbbim mənimlə qarşılaşdı və əl verib qucaqlaşdı. Əllərini çiynimə qoydu. Hətta onun barmaqlarının soyuqluğunu hiss etdim**".

Qazi İbn Cəmaə Şafei bu hədisin zındıqlar tərəfindən qondarıldığını ehtimal etmiş və belə demişdir: "**Bəlkə də bu, bəzi bidətçilər və ya zındıqların qondarmasıdır**". Bu sözləri "**Din düşmənləri, bidət və zəlalət əhlinin insanları dinlərindən çıxartmaq üçün uydurduqları zəif hədislər**" ünvanı altında qeyd etmişdir".[53]

**b) Əzududdin İyci.**

O, "əl-Məvaqif" kitabında belə deyir: "**Allah-taala hər-hansı bir cəhət və ya məkanda deyildir. Müşəbbihə buna müxalif çıxaraq Onun (Allahın) üst cəhətdə olduğunu demişlər. Sonra onlar bu məsələdə özləri ixtilafa düşmüşlər. Muhəmməd bin Kərram Onun (Allahın) cisimlərin olduğu kimi cəhətdə olduğunu demişdir. O, ərşin üst qatına təmas edir. Hərəkət, yerdəyişmə və cəhətləri dəyişmək Onun üçün icazəlidir. Yəhudilər bu əqidədədirlər. Hətta onlar ərşin yeni yəhər kimi səs çıxartdığını, (Allahın) ərşin üzərində oturduqda hər cəhətdən dörd**

---

[53] "əl-Miləl vən-Nihəl", c. 1, səh. 106.

**barmaq kənarda qaldığını deyirlər. Müşəbbihədən olan Məzər, Həməs, Əhməd Həcimi kimiləri bundan əlavə ixlaslı şəxslərin dünya və axirətdə Onu (Allahı) qucaqlayacaqlarını demişlər**". [54]

Bu sözlər həqiqətdir və hər birinin olması barədə dəlillər vardır. Tədqiqatçıların böyük əksəriyyəti Kəb bin Əhbarın israiliyyətləri (yəhudi dini mətnlərindən götürülənlər) rəvayətlərə daxil edən azğınlardan olmasında müttəfiqdirlər. Kəbin ərşin səsi və Allahın ağırlığı barədə dedikləri onun yolunu azmış zəlalət əhlindən olmasına dəlalət edir.

İbn Qəyyim Covziyyə "İctimaul-Cuyuşil-İslamiyyə"[55] kitabında belə demişdir: "Kəbul-Əhbarın sözü: Əbüşşeyx İsfahani "əl-Əzəmət" kitabında səhih sənədlə ondan belə nəql edir: "Bir nəfər onun yanına gəlib dedi: "**Ey Əbu İshaq, Cabbar olan Allah-taala barədə danış". Camaat bunun ağır söz olduğunu dedi. Kəb belə dedi: "Buraxın bu kişini! Əgər cahildirsə öyrənər, alimdirsə elmi artar". Sonra Kəb belə dedi: "Sənə xəbər verim ki, Allah yeddi səmanı və onun mislində də yeri yaratmışdır. Sonra hər iki səmanın arasında - dünya səması ilə yer arasındakı kimi yer. Onun qalınlığı kimi yaratdı. Sonra ərşi qaldırıb onun üzərində oturdu. Cabbarın (Allahın) ağırlığından göylərdə elə səma yoxdur ki, ondan yəhərdən çıxan səs kimi səs çıxmasın**".

Mən deyirəm: Zəhəbi "əl-Ərş"[56] kitabında belə deyir: "**Əbüşşeyx "əl-Əzəmət" kitabında bu rəvayəti səhih sənədlə qeyd etmişdir**". Baxmayaraq ki, bu kitab və "əl-Uluvv" kitabında hədisin mətnini təhrif etmişdir. Növbəti səhifələrdə bu barədə danışacağıq.

[54] "əl-Məvaqid", c. 3, səh. 29. Əbdürrəhman Ümeyrənin tədqiqi ilə.
[55] "İctimaul-Cuyuşil-İslamiyyə", c. 2, səh. 259-260.
[56] "əl-Ərş", c. 2, səh. 149, hədis 124.

Bununla da, yəhudi Kəbul-Əhbarın müsəlmanların kitablarına siraət etmiş əqidəsinin Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) dili ilə necə nəql olunduğu aydın oldu. Rəbbin ərş və ya kürsünün üzərində oturması, ərşin yəhər səsi kimi səs çıxarması yəhudi əqidəsidir və İslamla heç bir əlaqəsi yoxdur. Yəhudi və xristianların kitablarını araşdıran hər kəs bu məzmunda olan mətnlərlə rastlaşar.

Yəhudi və xristianların kitablarında bu məzmunda olan mətnlərdən Əhdi-Ətiqdə yazılan bu sözlərdir: "**Qanadları enmiş halda dayanarkən başları üzərindəki qübbədən bir səs gəldi. Başları üzərindəki qübbənin üstündə sanki göy yaqutdan düzəldilmiş taxta oxşar bir şey var idi. Yüksəklikdə, taxta oxşayan bir şeyin üzərində insana bənzər bir şəxs var idi**".[57]

Xristian Antonius ata bu mətni şərh edərək belə deyir: "**Qanadları enmiş halda dayanmışdır ki, Peyğəmbər onun səsini eşitsin. Necə ki, İlya ilə belə olmuşdur. Buna görə deyilir ki: "Qübbədən səs gəldi - yəni "taxtın üzərində oturanın (Allahın) səsi gəldi**".

Bu mətndə aşağıdakı məsələlər vardır:

**a)** Rəbb ərşin üzərində oturur və ərş Onu daşıyır.

**b)** Ərş qübbə kimidir.

Tədqiq etdiyimiz hədis də məhz bu iki xüsusiyyəti ehtiva edir. Hədisin mətnlərinə bax və düşün!

---

[57] "Əhdi-Qədim", Yezikel 1. 25, 26.

Qeyd etmək lazımdır ki, hədis hafizi olan Zəhəbi yəhudi Kəbul-Əhbarın etiqadının çirkinliyi və biabırçılığını gizlətmək üçün yuxarıda qeyd etdiyimiz "əl-Uluvv" kitabında "**Səmaların üstündəki Cabbarın (Allahın) ağırlığından**" sözlərini qeyd etməmişdir, lakin tədqiqatçı Seyid Həsən Səqqaf adı çəkilən kitabı tədqiq edərkən bu sözləri qeyd etmiş və belə demişdir: "**Zəhəbinin pozaraq qeyd etmədiyi söz budur: "Səmaların üstündəki Cabbarın (Allahın) ağırlığından". Bu sözləri eşidənlər belə cəfənglər danışmaması üçün onun ağzına daş qoymalı idilər. Təəccüb edirəm ki, həmin cəmiyyət ağamız Əlinin (Ona və pak ailəsinə salam olsun) dedikləri ilə razılaşmır, amma Kəbin belə cəfəng şeylər danışmasına necə izn verirdi?**".[58]

Həmçinin, Zəhəbi "əl-Ərş" kitabında da Əbüşşeyx İsfahaninin kitabından Kəbul-Əhbardan nəql olunan bu hədisi qeyd edərkən yenə həmin sözləri pozmuşdur.

**6.** Bu hədisin batil olması və Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) belə bir söz buyurmamasına dəlalət edən dəlillərdən biri də budur: Müsəlmanlar müxtəlif məzhəblərinə baxmayaraq, ilahi zat barədə nəql olunan rəvayətlərin olmasında müttəfiqdirlər. Baxmayaraq ki, onlar həmin rəvayətlərin anlaşılmasında ixtilaf etmişlər. Lakin araşdırma aparan hər bir şəxs müsəlmanların ittifaqına əsasən belə rəvayətlərin bəzilərinin qəbul olunmasına əmin ola bilər. Bu batil hədisə gəlincə, onu Hənbəli məzhəbindən olan hədis alimləri və təcsim əqidəsində olanlardan başqa heç kim nəql etməmişdir. Bu isə qeyd olunan hədisin batil və heç bir halda etimad edilməyəcək bir hədis olması barədə dediklərimizi təsdiqləyir.

---

[58] "əl-Uluvvu liləliyyil-Ğəffar", Səqqafın tədqiqi ilə, haşiyə, səh. 367.

Bu hədisin səhihlik, ağıl və məntiqdən uzaq olduğu aydın olduqdan sonra hikmət və insaf sahibləri bilməlidirlər ki, təcsim əqidəsində olanlar öz batil əqidələrini müdafiə etmək üçün ən zəif və batil dəlillərə istinad edirlər. Hətta bu, ilahi zata nöqsan gətirsə belə, onlar bundan çəkinmirlər. Bu hədis hörümçək torundan da zəifdir. Təcsim əqidəsində olanlar dini mətnlərlə öz həvayi-nəfslərinə uyğun tərzdə davranırlar. Bu cür batil hədislər səhih və mötəbər hədis kimi qələmə verilir, inkar edənlərə qarşı çıxılır və hər vəchlə onu müdafiə edirlər. Allah-taalanın şəninə layiq olmayan ürpəşdirici məsələləri Ona nisbət verirlər. Onların Rəbbin ağırlığının olmasına etiqad bəsləmələri məhz "**Ərşin səsi**" hədisinin meydana çıxmasının səbəbidir.

İbn Qəyyim Covziyyə "İctimaul-Cuyuşil-İslamiyyə" kitabında belə deyir: "İbn Cərir öz təfsirində belə demişdir: "Muhəmməd bin Səid əmisindən, o da İbn Abbasın "**Göylər az qalır yuxarılarından yarılsın...**"[59] ayəsi barədə belə dediyini nəql etmişdir: "**Yəni Rəhmanın (Allahın) ağırlığı və əzəmətindən**".[60] Onun "**Rəhmanın ağırlığı**" sözü təcsim əqidəsini aşkar şəkildə bəyan edir. Həmçinin, Əhli-Sünnə təfsirçisi Nizaməddin Nişapuri "Təfsiru-Nişapuri" adı ilə tanınan "Ğəraibul-Qurani və Rəğaibul-Furqan" kitabında belə deyir: "**İkrimə İbn Abbasdan belə nəql etmişdir: "Rəhmanın ağırlığından göylər yarılır". Əgər bu rəvayət səhih olarsa, zahiri mənasında təcsim əqidəsində olanların istinad etdikləri dəlildir**".[61]

---

[59] "Şura" surəsi, 5-ci ayə.

[60] "İctimaul-Cuyuşil-İslamiyyə", cild. 2, səh. 250.

[61] "Ğəraibul-Qurani və Rəğaibul-Furqan", cild. 6, səh. 67.

Həmçinin, Əbülqasim Rafei ağırlıq məsələsini və bu səbəbdən ərşin səsinin çıxdığını qəbul edir. Hətta o, bu məsələyə müxalif olan ayələri belə qəbul etmir. O, "ət-Tədvin fi Əxbari Qəzvin" kitabında belə deyir: "**Əgər yəhər dəmirdən olarsa, onun səsi daha çox olar. Ola bilsin ki, "ağırlıqdan onun səsi çıxır" hədisi "Onun üçün bunları mühafizə etmək heç də çətin deyil"[62] ayəsi ilə necə uyğun gəlir?" deyilsin, çünki burada "onları qorumaq kürsü üçün çətin deyildir" nəzərdə tutulur. Cavab budur ki: "Ən doğru təfsir ayədə Allahın nəzərdə tutulmasıdır.** (Yəni Allah üçün onları mühafizə etmək çətin deyil). **Hədis isə kürsünün elm və qüdrət deyil, məhz məlum olan kürsü olduğuna dəlalət edir**".[63]

Dəştinin "İsbatul-Həddi Lillah..." kitabını tədqiq edən Şeyx Müsəllit bin Bəndər Ətibi və Şeyx Adil Həmdan Allahın ağırlığı fikrini müdafiə etmiş, bu fikri ehtiva edən rəvayətləri və bu batil əqidədə olan alimlərin adlarını qeyd etmişlər. Onların Dəştinin kitabına yazdıqları haşiyəni qeyd edirəm: "Abdullah bin Əhmədin (Allah ona rəhmət etsin) "əs-Sunnə" kitabının tədqiqatçısı olan Muhəmməd bin Səid Qəhtani bu hədisin barəsində belə deyir: "**Mənim rəyim dudur ki, bu söz sifətin keyfiyyəti barədədir. Səhih dəlil bunu dəstəkləmir. Allahın kitabı və Allah rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) sünnəsində səhih olanlar bizi bundan ehtiyacsız etmişdir**".

Mən deyirəm: "Əgər onun məqsədi bu hədisin Allaha ağırlıq nisbət verməsini inkar etməkdirsə, bu, saleh sələfin əqidəsinə müxalifdir və qəbuledilməzdir. Allaha həmd olsun ki, o, bu sözü sələfdən heç kimə nisbət

---

[62] "Bəqərə" surəsi, 255-ci ayə.
[63] "ət-Tədvin fi Əxbari Qəzvin", c. 1, səh. 117.

verməyərək öz rəyi olduğunu deməklə bizi rahat etmişdir. Hədisin Allah-taalaya ağırlıq nisbət verməsinə gəlincə, dini mətnlər (hədislər), sələf və elm əhlinin sözləri buna dəlalət edir. Onlardan aşağıdakıların adlarını qeyd etmək olar:

1. Abdullah bin Məsudun (Allah ondan razı olsun) rəvayəti: "**Onun qəzəbini əvvəlcə ərşi daşıyanlar biləcək, onun ağır olduğunu hiss edəcəklər**". (Darami bu hədisi "ən-Nəqz" kitabının 114-cü səhifəsində nəql etmişdir).

2. Abdullah bin Abbasın (Allah ondan razı olsun) rəvayəti: "**Göylər az qalır yuxarılarından yarılsın...**" ayəsi barədə belə demişdir: "**Ağırlıqdan**". (Darami bu hədisi "ər-Rəddu aləl-Cəhəmiyyə" kitabının 88-ci səhifəsində; Əbüşşeyx "əl-Əzəmət" kitabının 235-ci səhifəsində; Hakim "əl-Mustədrək" kitabının 2-ci cild, 442-ci səhifəsində nəql etmişdir. Hakim belə demişdir: "**Sənədi səhihdir**". Zəhəbi onunla müvafiqdir. Həmçinin, İbn Cərir öz təfsirinin 7-ci cild, 25-ci səhifəsində buna bənzər hədis nəql etmişdir).

3. Kəbul-Əhbarın (Allah ona rəhmət etsin) rəvayəti. Həmin uzun rəvayətin sonunda belə deyilir: "**Cabbarın (Allahın) ağırlığından göylərdə elə səma yoxdur ki, ondan yəhərdən çıxan səs kimi səs çıxmasın**". (Bu rəvayəti Əbüşşeyx "əl-Əzəmət" kitabının 234-cü səhifəsində nəql etmişdir. İbn Qəyyim "İctimaul-Cuyuşil-İslamiyyə" kitabının 102-ci səhifəsində bu rəvayəti səhih hesab etmişdir. Həmçinin, Zəhəbi də "əl-Ərş" kitabında onu nəql etmişdir).

4. Xalid bin Mədan (Allah ona rəhmət etsin) belə deyir: "**Rəhman olan Allah-taala ərşi daşıyanlara yüngül olur. Kitabın mətnindəki məna budur**".

5. Həsən (Allah ona rəhmət etsin) öz təfsirində "**Göy o gün yarılacaqdır**"[64] ayəsi barədə belə deyir: "**Onun ağırlığından**". (Buxari bu rəvayəti öz "Səhih"-ində, "Müzəmmil" surəsinin təfsirində, Abdullah bin Əhməd isə "əs-Sunnə" kitabında nəql etmişdir. Sənədi səhihdir).

6. Mücahid (Allah ona rəhmət etsin) öz təfsirində "**Göy o gün yarılacaqdır**" ayəsi barədə belə deyir: "**Rəbbinin ağırlığından yarılacaqdır**". (Bu rəvayəti İbn Cərir və İbn Əbu Hatəm öz təfsirlərində, İbn Həcər isə "Səhih Buxari"-nin şərhinin 8-ci cild, 675-ci səhifəsində nəql etmişdir. Sənədi həsəndir).

7. İkrimənin nəql etdiyi rəvayət. (Həmin rəvayəti İbn Cərir öz təfsirində, Abdullah bin Əhməd isə "əs-Sunnə" kitabında nəql etmişdir).

8. Qətadənin nəql etdiyi rəvayət. (Həmin rəvayəti İbn Cərir öz təfsirində, Abdullah bin Əhməd isə "əs-Sunnə" kitabında nəql etmişdir. Mən deyirəm: "**Sələfin əksəriyyəti bu təfsiri qəbul edir**").

9. Əbülmüzəffər Səmani (Allah ona rəhmət etsin) öz təfsirinin 6-cı cild, 83-cü səhifəsində belə deyir: "**Göy o gün yarılacaqdır" ayəsi barədə sələfin əksəriyyətindən nəql olunub ki, (göy o gün) Allaha görə yarılacaqdır. Qiyamət günü məhkəmə üçün keyfiyyət olmadan enəcəkdir**".

---

[64] "Müzzəmmil" surəsi, 18-ci ayə.

10. Muhəmməd bin İshaq "**ərşin sifəti**" barədə belə deyir: "**Ərş kitab əhlinin vəsf etdiyi sifətdədir. Biz Onun əzəmətindən ağırlığının olmasını bildiyimiz üçün bunu inkar etmirik...**" (Bu rəvayəti Əbüşşeyx "əl-Əzəmət" kitabının 474-cü səhifəsində nəql etmişdir).

11. Qazi Əbu Yəla belə deyir: "**Bil ki, hədisi zahiri mənasında saxlamaq mümkündür. Ağırlıq Rəhmanın zatı ilə baş verir. Bu, Onun sifətlərindən uzaq deyildir**". ("Bəyanu Təlbisil-Cəhəmiyyə", cild. 1, səh. 574).

12. İbn Teymiyyə "Bəyanu Təlbisil-Cəhəmiyyə" kitabında Kəbul-Əhbarın yuxarıda qeyd etdiyimiz rəvayəti barədə danışarkən belə deyir: "**Bu rəvayət Kəbin rəvayəti olmasına baxmayaraq, onun kitab əhlinin elmlərindən olması ehtimal olunur. Ehtimal olunur ki, o, bunu səhabələrdən götürmüşdür. Kitab əhlinin rəvayətinin bizdə dəlili olmazsa, o nə inkar, nə təsdiq, nə də təkzib olunar. Hədisin sənədində adları çəkilən imamlar ən böyük imamlardandırlar. Onlar və qeyriləri bu hədisi nəql etmişlər. Onlar Cabbarın (Allahın) göylər üzərindəki ağırlığını inkar etməmişlər. Əgər bu sözdə İslam dininə müxalif bir şey olsaydı, onu bu cür nəql etməzdilər**".

13. İbn Qəyyim nəzmə çəkdiyi "Nuniyyə" kitabının 99 və 100-cü səhifələrində belə deyir:

"**Şura və Müzzəmmil surəsində,**

**Şəni olanın şəninin əzəmətinin sirri vardır.**

**Göylərin yarılması! Kim bunu bilmək istəsə,**

**O, yaxın olandır.**

**Sonrakılar onu nəql etməyə icazə verməmişlər,**

**Qorxu və imanda zəiflikdən!**

**Əvvəlkilər isə belə demişlər:**

**İslamın öndərləri - onlar bu məsələdə əmirdirlər.**

**Muhəmməd bin Cərir Təbəri isə öz təfsirində,**

**Bu barədə iki rəy söyləmişdir**”.[65]

---

[65] məzmun tərcüməsi

# YEKUN

İnsaflı şəxslər bu təvazökar araşdırmadan sonra təcsim məzhəbi, alimləri və kitablarının həqiqətlərini gözləri önünə qoymalıdırlar. Həmin həqiqətlərin bəzilərini qeyd edirəm:

1. Təcsim əqidəsində olanlar səhih olmayan hədislərin vasitəsilə etiqad kitablarına yəhudi etiqadlarını yerləşdirmişlər. Ağıl sahibi olan kəs həmin cahillərdən əqidə öyrənərkən ehtiyatlı olmalıdır. Onlar batil hədisləri düzgün əqidədən hesab etmişlər. Hətta onların rəylərinə əsasən, onlara müxalif olanların cəzası qətl və zibillikdə basdırılmadır.

Hakim Nişapuri "Mərifətu Ulumil-Hədis" kitabında belə deyir: "Muhəmməd bin Saleh bin Haninin belə dediyini eşitdim: "Əbu Bəkr Muhəmməd bin İshaq bin Xüzeymənin belə dediyini eşitdim: **"Kim Allahın yeddi göyün üzərində - ərşin üstündə oturmasını etiraf etməzsə, Rəbbinə küfr etmişdir. Həmin şəxs tövbə etməlidir. Əgər tövbə edərsə (bağışlanar), əks halda boynu vurulmalıdır. Müsəlmanlar və zimmilər iyindən əziyyət çəkməmələri üçün onun cəsədini zibilliyə atılmalıdırlar. Onun var-dövləti qənimətdir və heç kəsə miras olaraq verilməz, çünki Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) belə buyurmuşdur: "Müsəlman kafirdən irs aparmaz**".

2. Vəhabilik cərəyanı İslam ümmətində yaranmış təcsim cərəyanının davamıdır. Məhz buna əsasən də, onlar bu səpkidə olan batil hədislərə istinad edən əqidə kitabları çap edib, yayırlar. Buna əsasən də, bu hərəkatın islam təfəkkürünə zərbə vuran yəhudi əlinin olmasını desək, bu, heç də təəccüb doğurmaz.

3. Əhli-Beyt (əleyhimussəlam) məzhəbinə müxalif olan məzhəblərin əqidələrinə müdaxilə etmək olduqca asandır. Yəhudilər və ya zındıqların çoxlarının inanıb müdafiə etdiyi bu cür batil əqidələri qondarması olduqca sadədir. Əksinə, imamiyyə məzhəbinə qarşı belə etmələri mümkün deyil, çünki imamiyyə məzhəbinin alimləri sarsılmaz elmi əsaslar və dəqiq tədqiqatlarla buna imkan verməmişlər. Bu iddia hədis hafizi olan Şeyx Ğəmari kimi bir çox alimlərin sözlərində öz əksini tapmışdır.

Şeyx Nəzir Ətavinə "əl-İttifaq vəl-İtilaf beynəl-Muhəddisil-Ğəmari vəs-Seyyid Səqqaf" adlı kitabında belə deyir: "Seyid Abdullah Ğumari "Bidəut-Təfasir" kitabının 154-cü səhifəsində belə deyir: "**Bundan da təəccüblüsü odur ki, israiliyyət (yəhudi mənşəli hədis və əqidələr) alimlərin kitablarında doludur. İsrailiyyət onların ağıllarına o qədər hakim olmuşdur ki, hətta onların nəzərlərində əqidədən hesab olunur. Onlar Quranı bu cür israiliyyətlərə əsasən anlayırlar...**".

Seyid Ğumari (Allah onun məqamını uca etsin) aşağıdakı səhifədə (155-ci səhifə) belə deyir: "**Bax, gör israiliyyət alimlərimizin ağılları və təfəkkürlərinə hansı həddə hakim olmuşdur?!**".

4. Şiə məzhəbi öz əqidə əsaslarını sabit prinsiplər üzərində qurmuşdur. Həmin prinsiplər mütəvatir hədislərin əsasında formalaşmışdır. Halbuki onların müxalifləri əqidənin isbatı üçün heç bir əsası olmayan "**Ərşin səsi**" hədisi kimi qondarma hədislərə istinad edirlər. Əhli-Sünnə məzhəblərindən olan mötədil tədqiqatçılar bu cür cəfəngiyyatlar və qondarma hədislərə qarşı çıxmalı və müxtəlif coğrafi ərazilərdə yaşayan müsəlmanların əqidələrinə siraət etməsinin qarşısını almalıdırlar. İndiki

dövrdə fikirlərin təshih olunması, araşdırılıb-arındırılması müxtəlif azğın fikirlərə məruz qalan müsəlman gənclərə veriləcək ən gözəl əməldir.

Allah müvəffəqiyyətin hamisidir!